۴۳

لایق می صالب عاشقی فردالره دایم[۱]،
ای سرو روان اولمیه سنک عهدنه قایم.
جائزمدی مجنونه قویب کوی نگاری،
دایم گزه صحرالری مانند بهایم.
انسانه جهان ایچره بودر دولت عظما،
بر یار ملایمله مقارن اوله دایم.
هجر لب لعلونکده دوشلدک می نابه،
دایم دل دیوانه دورر دیرده نایم[۲].
یاینی چکردوک فلکینک نیسه **بصیری**،
گیرسیدی اگر قبضمه بر یار ملایم.

*Layiqmi salıb aşiqi fərdalara daim,*
*Ey sərvi-rəvan olmayasan əhsinə qaim.*
*Caizmidi Məcnuna qoyub kuyi- nigari,*
*Daim gəzə səhraları manəndi-bəhaim.*
*İnsana cahan içrə budur dövləti-üzma,*
*Bir yari-mülaimlə müqarin ola daim.*
*Hicri-ləbi-ləəkinində düşəldin meyi-nabi,*
*Daim dili-divanə durur deyridə naim.*
*Yayını çəkirdin fələyin, neysə Bəsiri,*
*Girsəydi əyər qəbzəmə bir yari-mülaim.*

---

۱. غزل تهران و استانبول آلیازمالاریندا یوخدور "بحر المعارف"-دن ۸۳ آلینیبدیر.
۲. یاتمیش ، اویموش

۴۴

گرچه کم یقدر مسیح انفاسینک فرقنده دم[1]،
شمدی اعجاز لبونک کجمشدور انی ای صنم.
وصف حسنونک مو بمو تحریر و تقریر اتمکه،
اولدی جانا خط مشکینندکی هر قل قلم.
صرف نقد جانله تصریفه گلمز اول پری،
ای معلم سن دیلدک قدینه رایت علم.
هر حباب جام می بر دمده برباد اولدغی،
جرم جم عفو اولدغنه بر نشاندر لاجرم.
خسرو ملک کلامم بن کمال نظم ایله،
بر حشم شکلیندر باکا **بصیری** محتشم.

*Gərçi kim, yoxdur Məsih ənfasının fərqində dəm,*
*Şimdi ecazi-ləbin geçmişdür anı, ey sənəm.*
*Vəsfi-hüsnün mu bəmu təhriru təqrir etməyə,*
*Oldı cana xətti-müşkinindəki hər qıl qələm.*
*Sərfi-nəqdi can ilə təsrifə gəlməz ol pəri,*
*Ey müəllim, sən dilədin qəddinə rəyət ələm.*
*Hər hubabi-cami-mey bir dəmdə bərbad olduğı,*
*Curmi-Cəm əfv olduğuna bir nişandır lacərəm.*
*Xosrovi-mülki-kəlaməm mən kəmali-nəzm ilə,*
*Bir həşəm şəklindədir bana, Bəsiri, möhtəşəm.*

---

[1]. غزل تهران و استانبول آلیازمالاریندا یوخدور "بحر المعارف"-دن ۸۳ آلینیبدیر.

۴۵

سرشک دیده غم دیدمی بر بحر خون ایتدم[1]،
سر خونینمی اندن حباب لاله‌گون ایتدم.
بنم اول مرد خشم افکن بو تیغ تیز نظمم‌له،
بلاغت ملکونک سرورلرنک جمله زبون ایتدم.
بنم اول اشنای لجه بحر معارف کم،
نیجه غواص بحر نظم انده سرنگون ایتدم.
جنون اهلیک زبون اتمش کمند زلفنی گوردم،
بن اول سودا ایله شمدی تقاضای جنون ایتدم.
فنون فضل و عرفانک خبیریم **بصیری**یم،
معانی مفرداتک جمع ایدوب جمله یکون ایتدم.

*Sirişki-dideyi-ğəm didəmi bir bəhri-xun etdim,*
*Səri-xuninimi andan hubabi-laləgun etdim.*
*Mənəm ol mərdi-xəşməfkən, bu tiği-tizi nəzmimlə,*
*Bəlağət mülkünün sərvərlərin cümlə zəbun etdim.*
*Mənəm ol aşinayi-ləccəyi-bəhri-məarif kim,*
*Neçə ğəvvasi-bəhri-nəzmi anda sərnigun etdim.*
*Cunun əhlin zəbun etmiş kəməndi-zülfuni gördüm,*
*Mən ol sevda ilə şimdi təqazayi-cunun etdim.*
*Fununi-fəzliu irfanın xəbiriyəm, Bəsiriyəm,*
*Məani müfrədatın cəəm edib, cümlə yekün etdim.*

[1]. غزل تهران و استانبول ألیازما لرینده یوخدور "مجموعه المعارف"-دن۸٤ آلینیبدیر.

۴۶

نازیله ای غنچه فام گلزاره عزم ایت صبحدم[١]،
دور گل هنکام ملدر[٢] عیش و نوش ات دمبدم.
هر گل تر روز و شب عرض عذار ایلر سکا،
بونجه آه و غم ندر ای عندلیب خوش نغم.
آب شبنمله جلا ویر گله تاب آفتاب،
سوسن آزادنونک تیغنده نیلر زنگ غم.
سرو قد هرجایلرده گورمدوم ای فاخته،
عهدینه طورمش سنوک کبی ثابت قدم.
ای **بصیری** بر بنم کم مرغزار دهرده،
هر گل نازک بدندن حاصلم جور و ستم.

*Naz ilə ey ğönçə fam gülzara əzm et sübhdəm,*
*Dövri-gül, həngami müldür eyşu-nuş et dəmbədəm.*
*Hər güli-tər ruzu şəb ərzi-üzar eylər sənə,*
*Bunca ahu ğəm nədir, ey əndəlibi-xoş nəğəm.*
*Abi-şəbnəmlə cəla ver gülə tabi-aftab,*
*Süsəni-azadənin tiğində neylər zəngi-ğəm.*
*Sərvqədd hərcayilərdə görmədim, ey faxtə,*
*Əhdinə durmuş sənin kimi sabit qədəm.*
*Ey Bəsiri, bir mənəm kim, mərğzari-dəhrdə ,*
*Hər güli-zanik bədəndən hasilim cövrü sitəm.*

---

[١]. غزل تهران و استانبول أليازما لرينده يوخدور "مجموعه المعارف"-دن ٨٤ آلينيبدير.
[٢]. اوزوم شرابی

۴۷

تیغ جفایله یورکم پاره ایلدک،
بر یاره بتمدن داخی بر یاره ایلدک.
یارب قرا بکی بکی اول ماه پاره نک،
بختم ستاره سینی ندن قاره ایلدک.
گلگون قبا گیوب ینه ای سرو گل کبی،
صبرم لباسنی نیچون[۱] پاره ایلدک.
دردینه چاره یوق درمش سن بو زاریچون،
داخی نه چاره کم بنی بیچاره ایلدک.
یوزی خود[۲] آفتاب **بصیری** نه وجهله،
مهر سپهر آدنی رخساره ایلدک.

*Tiği-cəfa ilə ürəyim parə eylədin,*
*Bir yara bitmədən daxı bir yara eylədin.*
*Ya rəb, qara banı kibi ol məh parənin.*
*Bəxtim sitarəsini nədən qara eylədin ?*
*Gülgun qəba geyib, yinə ey sərv gül kimi,*
*Səbrim libasını neçün parə eyləsin ?*
*Dərdinə çarə yox dermişsən . bu zar üçün,*
*Daxı nə çarə kim, məni biçarə eylədin.*
*Üzi xud afitab, Bəsiri nə vəch ilə,*
*Mehri-sipehr adını rüxsarə eylədin.*

---

۱. س. یقاسنی ینه صدپاره
۲. س. یوزی در

۴۸

دام زلف عنبرینک دانه سن خال ایلدوک[1]،
جانمی مرغ قفس تک مضطرب حال ایلدوک.
مه یوزونده منخسف[2] اولمش کواکبدر بنم،
سن انوک ادنک نه یوزدن عنبرین خال ایلدوک.
بختمی وه کم قرا اتمکه[3] قانم دوکمگه،
چشمنی هر دم سیه و لبلرنک ال ایلدوک.
دیر ایدوک دون کم رقیب کافری اولدوررم،
یا نیچون اول کافرونک قتلینده اهمال ایلدوک.
کاکلوک ای **بصیری** بر قلن شرح اتمدوک،
بونجه کم وصفنده انونک قل ایله قال ایلدوک.

*Dami-zülfi-ənbərin danəsin xal eylədin,*
*Canımı mürği-qəfəs tək müztərib hal eylədin.*
*Məh üzündə münxəsif olmuş kəvakibdir mənim.*
*Sən onun adın nə üzdən ənbərin hal eylədin.*
*Bəxtimi vəh kim, qara etməyə, qanım tökməyə,*
*Çeşmini hə dəm siyəhu ləblərin al eylədin.*
*Der idin dün kim, rəqibi-kafəri öldürürəm,*
*Ya neçün ol kafərin qətlində ihmal eylədin.*
*Kakulun , ey Bəsiri, bir qılın şərh etmədin,*
*Bunca kim, vəsfində onun qıl ilə qal eylədin.*

---

[1]. غزل دیوانلاردا یوخدور. نظمی مجموعه سینده وار (۲٤۹۷) و پروانه ده (٤۳۰۹) وار
[2]. گیزلنمش ، اؤرتولو
[3]. پروانه: قرارتماغه بو قانوم

۴۹

مه برج لطافت در رخ زیباسی خورشیدک[1]،
نهال باغ جنت در قد و بالاسی خورشیدک.
بوگون بر ماه دوراندر که یوقدر مثل و همتاسی،
مگر آینه ایچنده اولا همتاسی خورشیدک.
نه قاره گونلره قالدم که شامم هیچ روز اولمز،
گوزمدن اوللی پنهان رخ زیباسی خورشیدک.
مه اولر دف کواکب پوللری زهره اولر مطرب،
قچن کم رقصه گیره قامت رعناسی خورشیدک.
نه قیلم نیلیم ای دوستلر بر چاره ایلک کم،
بنم بیکی بک اولسه یوقدرر پرواسی خورشیدک.
بوگون فردایه صالر ای **بصیری** وصلنه وه کم،
توکنمز هیچ عالمده بو گون فرداسی خورشیدک.

*Məhi-bürci- lətafətdir rüxi-zibası xurşidin,*
*Nəhalı-bağı-cənnətdir qədu balası xurşidin.*
*Bugün bir mahi-dövrandır ki, yoxdur mislu həmtası,*
*Məgər ayinə içində ola həmtası xurşidin.*
*Nə qara günlərə qaldım ki, şamım hiç ruz olmaz,*
*Gözümdən olalı pünhan rüxi-zibası xurşidin.*
*Məh olar dəf, kəvakib pulları, Zöhrə olar mütrib,*
*Qaçan kim, rəqsə girə qaməti-rənası xurşidin.*
*Nə qılam, neyləyim ? ey dostlar, bir çarə eylən kim,*
*Mənim kimi min olsa, yoxdurur pərvası xurşidin.*
*Bugün-fərdaya salır, ey Bəsiri, vəslinə , vəh kim,*
*Tükənməz hiç aləmdə bugün, fərdası xurşidin.*

---

[1]. غزل استانبول ألیازما سینده یوخدور.

۵۰

بن بلغور آشنی سومزسم تانریم اکا ایرگورمسونک[۱]،
دانه برنجی قولیام شورباسی گوزم گورمه سونک.
بن قلیه نونک درویشیم هم صالمانک افتاده سی،
بومبر انن صالنماسنک بورک انن اوفرمه سونک.
دن کم کسیلسوک دانه دن اول رشتیه یوخسه بو دم،
بر پاره یر ایکن دخی اول اراده اوتورمه سونک.
پالودیه مسکین صانوب دیدم اکا اسرارمی،
بادام دلیله دیمش سروم گتسونک طورماسونک.
مسکین **بصیری** کوکلونی مانتویه ماوا ایلدی،
یا رب کلم شورباسنی گوسترمه کانی گورمه سونک.

*Bən bulğur aşını sevməzəm, tanrım ona irgürməsin,*
*Danəyi-birincin quluyam, şorbası gözüm görçəsin.*
*Mən qəlyənin dərvişiyəm, həm salmanın üftadəsi,*
*Bimbər inən salınmasın, börək inən üfürməsin.*
*Dən kim, kəsilsin danədən, ol riştəyə yoxsa bu dəm,*
*Bir para yer ikən daxı ol arada oturmasın.*
*Paludəyi miskin sanıb, dedim ana əsrarımı,*
*Badam dililə demiş sərvim getsindurmasın.*
*Miskin Bəsiri könlüni mantuya məva eylədi,*
*Ya rəb, kələm şorbasını göstərmə, ki, anı görməsin.*

---

[۱]. غزل تهران ألیازما سینده یوخدور. غزلین اصلی "بنک نامه"دن آلینیبدیر بورادا گؤستریلن "قلیه" آذربایجانلیلارا مخصوص خورکدیر عثمانیلیلار تانیمازلار.

۵۱

ساقی غلمان آب کوثر در میی پیمانه نک[1]،
جنت الماوا بکا هر گوشه سی میخانه نک.
عاشق دیوانه نیلر میل ایدوب تسبیحه کم،
سبحهٔ[2] صددانه زنجیری درر دیوانه نک.
اتحادی شمعله پروانه نک اول حده در،
اوده دوشسه هر قلی بر شمع اولر پروانه نک.
ایدامز مشکین صچک وصفن شهابکدن بر،
هر طرفدن گرچه کم یوز دیلی واردر شانه نک.
گرچه کم تختیله فخر ایلر شه عالم ولی،
تخت شاهی اولدی هر خشتی بکا ویرانه نک.
خواب گلمز چشممه افسانه یله ای رفیق،
گرچه درلر خواب در خاصیتی افسانه نک.
ای **بصیری** عکس چشم رند درد آشام در،
اول عبایی کم دوشپدر یوزنه پیمانه نک.

*Saqiyi-ğılman, abi-kovsərdir meyi-peymanənin,*
*Cənnətul-məva mənə hər guşəsi meyxanənin.*
*Aşiqi-divanə neylər meyl edib, təsbihə kim,*
*Sühəyi-səd danə zənciri durur divanənin.*
*İttihadı şəm ilə pərvanənin ol həddədır,*
*Oda düşsə hər qılı bir şəəm olur pərvanənin.*
*Edəməz mişkin saçın vəsfin şəhabından birin,*
*Hər tərəfdən gərçi kim, yüz dili vardır şanənin.*
*Gərçi kim, təxtilə fəxr eylər şəhi-aləm , vəli,*
*Təxti-şahi oldı hər xişti mənə viranənin.*
*Xab gəlməz çeşmimə əfsanə ilə, ey rəfiq,*
*Gərçi dirlər xabdır xasiyyəti əfsanənin.*
*Ey Bəsiri, əksi-çeşmi rind dərdaşamdır,*
*Ol əbayi kim, düşübdür üzünə peymanənin.*

---

[1]. س. بو غزل یوخدور
[2]. تسبیح

۵۲

بر یکا طعن رقیب و بر یکا جورک سنک،
داد الندن دوستک فریاد الندن دشمنک.
نیلیم بن خلعت سنجابی گیوب دوستلر،
کم بکا خاکستر سنجاب اولپدر گلخنک.
روشن ایدن کلبهٔ احزانمی آهم یتر
ذرجه گوزومه گورنمز ضیاسی روزنک.
سنگ خارادر سنک سینکده اولن دل ولی
بو عجایب حال کم روح مجسم در سنک.
داخی تصدیع[۱] اتمز اولدی کثرت رنج خمار،
ای کوکل میخانهٔ وحدت اولالی مسکنک
عشق ایچنده عاقل اولوردی ایدوب ترک جنون
ای **بصیری** گورپ گر شیدالغک مجنون سنک.

*Bir yana təni-rəqibu bir yana cövrün sənin,*
*Dad əlindən dostun, fəryad lindən düşmənin.*
*Neyləyin bən xələti-səncabi geyib dostar,*
*Kim, bana xakistəri-səncab olubdur, külxənin.*
*Rövşən edən külbeyi- əhzanımı ahım yetər,*
*Zərrəcə gözümə görünməz ziyası rövzənin.*
*Səngi-xaradır sənin sinəndə olan dil, vəli,*
*Bu əcayib hal kim, ruhi-mücəssəmdir sənin.*
*daxı təsdii etməz oldı kisrəti-rənci xumar,*
*Ey könül, meyxaneyi- vəhdət olalı məskənin.*
*eşq içində aqil olurdı, edib tərki-cunun,*
*Ey Bəsiri, görüb gər şeydalığın Məcnun sənin.*

---

[۱]. باش آغریسی، زحمت

۵۳

لبکی تاب می نابله گلگون ایتدک،
ینه ای غنچه دهن یورگمی[۱] خون ایتدک.
اویرب نرگسکی خوابمی الدک گوزدن،
گسترب[۲] را قشکی قامتمی نون ایتدک.
لب شیرینله عاشقلری ایتدک فرهاد،
لیلی زلفله عاقللری مجنون ایتدک.
چشم سرمستکی بک ناز و کرشمیله ینه،
فتنه خوابندن اویردک بزی مفتون ایتدک.
صلدک اود خرمن صبرینه **بصیری**نک آه،
ای یوزی لاله لباسوکی چون گلگون ایتدک.

*Ləbini tabi-meyi nab ilə gülgun etdin,*
*Yinə ey ğönçə dəhən ürəyimi xun etdin.*
*Uyarıb nəgisini xabımı aldın gözdən,*
*Göstərib ra qaşını, qamətini nun etdin.*
*Ləbi Şirin ilə aşiqləri etdin Fərhad,*
*Fitnə xabından uyardın, bizi məftun etdin.*
*Saldın od xərməni-səbrinə Bəsirinin, ah,*
*Ey üzi lalə, libasını çün gülgun etdin.*

---

[۱]. س. یوزکی
[۲]. س. کتورب

*Gər biləm kim, əzmi bundan yanadır tirin sənin,*
*Ey kaman əbru edim çeşmimi zehgirin[1] sənin.*

*Lalə rüxsarında olan xal kimi, ey könül,*
*Ol xəlili-canu dil od eylədi yerin sənin.*
*Bu nə təəbir kəlamu bu necə hüsni-əda,*
*Yusifi söylətməz oldı hüsni-təəbirin sənin.*
*Öldürüm derdin məni, təəxir etdin bilmədim,*
*Kim, nədən oldı bu xeyr işində təəxirin sənin.*
*Cavdani can bulur, tiğindən ölən sanasan,*
*Çeşmeyi-heyvandan içmiş suyi şəmşirin sənin.*
*Hər tərəfdən çeşmi-aşkardır edər sənən nəzər.*
*Ruyun[2] üzrə həlqəyi-zülfi· girihgirin[3] sənin.*

*Gər şikarında bulunsa ahuyi-Çin, ey pəri,*
*Göz qaradıb, can atar olmağa nəxcirin[4] sənin.*

*Zəccəsi şeyxin əgərçi danə ilə damdır,*
*Ey dili-divanə təsbih oldı zəncirin sənin.*
*Hiç əldən qoymaz olmuşsan rəhi-meyxanəyi,*
*Ey Bəsiri, şöyləmi göstərdi yol pirin sənin ?*

---

[1] . kirişi tutan
[2] . üzün
[3] . düyün-düyün, buruq-buruq
[4] . ov, şikar

۵۴

گر بلم کم عزمی بندن یاکه در تیرک سنک،
ای کمان ابرو ایدم چشممی[۱] زه‌گیرک سنک.
لاله رخسارنده اولن خال کبی ای کوکل،
اول خلیل جان و دل اود ایلدی یروک سنک[۲].
بو نه تعبیر کلام و بو نجه حسن ادا،
یوسفی سویلتمز اولدی حسن تعبیرک سنک[۳].
اولدرم دردک بنی تاخیر ایتدک بلمدم،
کم ندن اولدی بو خیر ایشنده تاخیرک سنک[۴].
جاودانی جان بلور تیغکدن اولن صانه سن[۵]،
چشمهٔ حیواندن ایچمش صویی شمشیرک سنک.
هر طرفدن چشم آشکاردر ایدر سکا نظر،
رویوک اوزره حلقه زلف کره‌گیروک سنک[۶].
گر شکارکده بولنسه آهوی چین ای پری،
گوز قراردوب جان اتر اولماغه نخجیرک سنک[۷].
صجه‌سی شیخک اگرچه دانیله دامدر،
ای دل دیوانه تسبیح اولد زنجیرک سنک[۸].
هیچ الدن قومز اولمش سن ره[۹] میخانه یی،
ای **بصیری** شویلمی[۱۰] گستردی یول پیرک سنک.

---

۱. س. چشممی ایدم او دم ای دوست
۲. تهران ألیازما سینده بو بیت یوخدور.؛ پروانه ده (٤١٩١ ) یوخدور
۳. بو بیت س. ألیازما سینده یوخدور؛ پروانه ده بو بیت یوخدور
٤. بو بیت س. ألیازما سینده یوخدور.مظمی: کم ندن اولمش بو خیر اچنده تعبیرک
٥. س. اولن کوییا ؛ نظمی و پروانه:جاودانی جان ویرر تیغنک شهید اولانلره
٦. باشقا منبع لرده بو بیت یوخدور.
٧. پروانه مجموعه سینده بو بیت یوخدور.
٨. پروانه ده بو بیت یوخدور
٩. س. طریق
١٠. س. بویله می ؛ نظمی: بویله می

۵۵

نه بلاانگیزدر اول چشم فتاننک سنونک[1]،
نه شکرآمیزدر لعل در افشاننک سنونک.
قاپوسنده اوتوررکن دیدی دربانی بکا،
صبر قل بر لحظه کم شمدی چیقر جانونک سنونک.
برقعهٔ مشکین اصوب زلفک حریم حسنکه،
سایه بان عنبرآویز اولدی ایواننک سنونک.
منع ایدرسک هر نفس یوزندن ای ناصح بنی،
کافرم گر وار ایسه باللـه ایماننک سنونک.
ای **بصیری** اولمدی آهک موثر گرچه کم،
طاشه تاثیر ایلدی آهیله افغاننک سنونک.

*Nə bəlaəngizdir ol çeşmi-fətanın sənin,*
*Nə şəkəramizdir ləəli-durr əfşanın sənin.*
*Qapısında oturarkən dedi dərbanı[2] mana,*
*Səbr qıl bir ləhzə kim, şimdi çıxar canın sənin.*
*Burqəyi[3]-mişkin asıb zülfün hərimi-hüsnünə,*
*Sayəbani-ənbəraviz oldı eyvanın sənin.*
*Məən edərsən hər nəfəs üzündən, ey nasih, məni,*
*Kafərəm gər var isə billah imanın sənin.*
*Ey Bəsiri, olmadı ahın müəssir, gərçi kim,*
*Daşa təsir eylədi ah ilə əfğanın sənin.*

---

[1]. غزل تهران دیواندا یوخدور. نظمی (۲۵۹٤) و پروانه (٤۳٤۰) مجموعه سینده وار.
[2]. qapıçı
[3]. yaşmaq

۵۶

قنده وارم سایه سرو بلندم وار اکن،
کیمه قول اولم سنک کیبی افندیم وار اکن.
شرح درد عشقی آخر کیمه تقریر ایلیم،
بر کوکل آدلو مصاحب دردمندم وار اکن.
ای پری مکر رقیب دیو سیرتدن نه غم،
خالی رخسارک کبی اوده سپندم وار اکن.
پند ناصحله نه امکان کم قلم ترک جنون،
عشق پیرندن بنم گوشمده پندم وار اکن.
بکه قورتلمق پریشانلکدن اولمشدر محال،
طرهٔ جانان کبی بوینمده بندم وار اکن[۱].
گلشن عالمده هرگز اگمیم بر سروه باش،
ای **بصیری** قامت سرو بلندم وار اکن.

*Qanda varım sayeyi-sərvi-büləndim var ikən,*
*Kimə qul olam sənin kimi əfəndim var ikən.*
*Şərhi-dərdi-eşqi axir kimə təqrir eyləyim,*
*Bir könül adlı müsahib, dərməndim var ikən.*
*Ey pəri, məkri-rəqibi-div sirətdən nə ğəm,*
*Xalı rüxsarın kimi odda sipəndim var ikən.*
*Pəndi-nasihlə nə imkan kim, qılam tərki-cunun,*
*Eşq pirindən mənim guşumda pəndim var ikən.*
*Bana qurtulmaq pərişanlıqdan olmuşdur mahal,*
*Türrəyi-canan kimi boynumda bəndim var ikən.*
*Gülşəni-aləmdə hərgiz əyməyim bir sərvə baş,*
*Ey Bəsiri, qaməti-sərvi-büləndim var ikən.*

---

[۱]. پروانه مجموعه سینده (٥٦٥٨) بو بیت یوخدور.

۵۷

ای کوکل سنسن بنی آشفته و شیدا قلن[۱]،
شهرۀ شهر ایلیوب هر کوجده رسوا قلن.
عالمی اشفته و داغ اورد مسکین کوکله،
ایغکی سنبل یوزوکی لاله حمرا قلن.
اغلمقده گوز یوموپ اچمق دکزلر موجیدر،
قل حذر بو موجدن ای اشگمی دریا قلن.
گاه اغلتدی بنی گه یقدی نار شوقله،
یوزوکی هر وجهله شمع جهان آرا قلن.
یروکی اتدی جهنم اول سر کودن اراق،
ای **بصیری** کوی یاری جنت الماوا قلن.

*Ey könül sənsən məni aşüftə vu şeyda qılan,*
*Şöhreyi-şəhr eyləyib, hər küçədə rusvay qılan.*
*Aləmi aşüftə vu dağ vurdı miskin könlünə,*
*Ayağını sünbül u üzüni  laləyi-həmra qılan.*
*Ağlamaqda göz yumub-açmaq dənizlər mövcidir,*
*Qıl həzər bu mövcdən, ey əşkimi dərya qılan.*
*Gah ağlatdı məni, gəh yaxdı nari-şövq ilə,*
*Üzüni hər vəhcilə şəmi-cahanara qılan.*
*Yerini etdi cəhənnəm ol səri-kudan iraq,*
*Ey Bəsiri, kuyi-yari cənnəti-məva qılan.*

---

[۱]. س. أليازما سينده بو غرل يوخدور.

۵۸

گورمکیچون نور حقی دوست سیماسنده بن،

ساکن اولدم کوی یارک طور سیناسنده بن.[۱]

سودوگمدن ایرو فردوسی بکا عرض اتسه حق،

طورمزم محبوبسز فردوس اعلاسنده بن.

آهو گوزلوم فرقتندن اولمشم مجنون کیبی،

لیلی یه زلفونک اوجندن عشق شاهراسنده بن.

نیجه سی ترک ایلیم اول لعل لب ذکرنی کم،

جان شیرین بولمشام لعل شکر خواسنده بن.

ای **بصیری** تن مدر دیوانه اولسم شمدی کم،

ییلر اولموشدر ییلروم زلف سوداسنده بن.

*Görmək üçün nuri-həqqi dost simasında bən,*
*Sakin oldum kuyi-yarın Turi-Sinasında bən.*
*Sevdiyimdən ayrı ferdosi mənə ərz etsə Həqq,*
*Durmazam məhbubsız fərdosi-əlasında bən.*
*Ahu gözlüm firqətindən olmuşam Məcnun kimi,*
*Leyliye zülfün ucundan eşq şahrahsında bən.*
*Necəsi tərk eyləyim ol ləli-ləbi -zikrini kim,*
*Cani-şirin bulmuşam ləəli-çəkərxasında mən.*
*Ey Bəsiri, tənmidir divanə olsam şimdi kim,*
*Yellər olmuşdur yillərim zülfi-sevdasında mən.*

---

[۱]. بورادا تهران ألیازما سینده صفحه دوشمه سی وار. سونراکی صفحه"سود" سوزو ایله باشلانیر.

۵۹

ای بنی مهر و وفا بیکی فراموش ایلین،
نالمی ایشتمیوب غیرک سوزن گوش ایلین.
ساغر چشممدن ایچدوکچه جگر قانن درم،
عشقکه ای غیرله هر دم قدح نوش ایلین.
خضر کیبی عالم ایچنده بولور عمر ابد،
بر گجه سن سیمبر ماهی در اغوش ایلین.
جبه سینی صبرمک دردیله صد چاک ایلدی،
سن سمن رخساره یی سرو قباپوش ایلین.
ای **بصیری** عالمی غرق اتدی سرتاسر مگر،
دل تنورندن یاشک طوفانی در جوش ایلین

*Ey məni mehru vəfa kibi fərmuş eyləyən,*
*Naləmi eşitməyib, qeyrin sözün huş eyləyən.*
*Sağəri-çeşmimdən içdikcə ciyər qanın dirəm,*
*Eşqinə , ey qeyrilə, hər dəm qədəh nuş eyləyən.*
*Xizr kibi aləm içində bulur ömri-əbəd,*
*Bir kecə sən simbər mahi dərağuş eyləyən.*
*Cübbəsini səbrimin dərdilə səd çak eylədi,*
*Sən səmən rüxsarəyi sərvi-qəbapuş eyləyən.*
*Ey Bəsiri, aləmi qərq etdi sərtasər , məgər,*
*Dil tənurindən*[۱] *yaşın tufanıdır cuş eyləyən.*

[۱] . təndirindən

۶۰

هر غزل کم دنیولور اول یوز و گوز و قاشچون،
نقش بغلک دوستلر اول دلبر نقاشچون.
دل یرار یولداشدر یانکدن اکسک اتمه کم،
جان ویرر جانا سنک تیغک یرار یولداشچون.
کاشکی بر طاش اولیدی باشمز یولکده کم،
حسرت التور باشمز یولکدکی هر طاشچون.
بن کمم کم خاک پایک ایدم افسر[۱] باشمه،
تاج دولت در قچن زیبا گلور هر باشچون.
گر **بصیری** اتلری اوکنده اولسه یوق عجب،
بو مقرر جان ویرر یولداش اولن یولداشچون.

*Hər qəzəl kim, denilir ol üzü göz u qaşı üçün,*
*Nəqş bağlın dostlar ol dilbəri-nəqqaş üçün.*
*Dil yarar yoldaşdır yanından əksik etmə kim,*
*Can verir cana sənin tiğin yarar yoldaş üçün.*
*Kaşki bir daş olaydı başımız yolunda kim,*
*Həsrət altır başımız yolundakı hər daş üçün.*
*Mən kiməm kim, xaki-payını edəm əfsər başıma,*
*Taci-dövlətdır qaçan ziba gəlir hər baş üçün.*
*Gər Bəsiri itləri önündə olsa, yox əcəb,*
*Bu müqərrər can verir yoldaş olan yoldaş üçün.*

---

[۱]. تاج

۶۱

اول مه بقال کم رخساری گلدر یاسمن[۱]،
دل ربابلرده اودر شمدی ترازودن اینن.
حسن بازارنده اول گل تارتیلورکن ای ایله،
گوگه چقدی کفه مه یرده اول سیمین بدن.
هیچ دکان اوکنده بر یره گیتمز مگر،
بال چالمش عاشقونک اغزینه اول شیرین دهن[۲].
هر قچن کم تارتر اول شیرین دهن بال یله یاغ،
جانومه حلوا بشورر صانورم اول دمده بن.
قطره قطره اشگ عاشقدر دگل عناب تر،
ای **بصیری** طبله‌سی اچنده هر دم صاتیلن.

*Ol məhi-baqqal[۳] kim, rüxsarı güldür, yasəmən,*
*Dilrübarlar da odur şimdi, tərazudan inən.*
*Hüsn bazarında ol gül dartılırkən ay ilə.*
*Göyə çıxdı kəffeyi-məh, yerdə ol simin bədən.*
*Hiç dukan önündə bir yerə getməz, məgər,*
*Bal çalmış aşiqin ağzına ol şirin dəhən.*
*Hər qaçan kim, dartar ol şirindəhən bal ilə yağ,*
*Canıma həlva bişirir, sanıram ol dəmdəmən.*
*Qətrə-qətrə əşki-aşiqdır, dəgil ənnabi-tər,*
*Ey Bəsiri,  təbləsi[۴] içində hər dəm satılan.*

---

[۱]. غزل دیواندا یوخدور. نظمی مجموعه سینده وار. (۳۳۲۸) و پروانه ده (۵۸٦۲) وار.
[۲]. پروانه: بال چالمش آغزینه عشاقک اول غنچه دهن

[۳] . sözün kökü türkcədir baxal
[٤] . satıcı tabağı

۶۲

خلقه جهان گلستان گلزار باکه زندان،
ایل غنچه کبی خندان بن ابر کیبی گریان.
هر قطره قطره قان کم دوکلدی چشم تردن،
ارباب عشقه اولدی تسیح لعل و مرجان.
گزلر کمان قشکده مژگان اوقن بنمچون،
کافر گوزوکه یارب بن نتدم آ مسلمان.
گیوب قبای گلگون ای سروقد صالنسک،
قلمزدی خلق اچنده چاک اولمدن گریبان.
بر بوسنه[۱] حبیبم جان المغ ایلمش نرخ،
تعجیل ات **بصیری** کم تیز اولر پشیمان.

*Xalqa cahan gülistanı gülzar, bana zindan,*
*El ğönçə kimi xəndan, mən əbr kimi giryan.*
*Hər qətrə-qətrə qan kim, töküldi çeşmi-tərdən,*
*Ərbabi-eşqə oldı təsbihi-ləlu mərcan.*
*Gözlər kaman əbru, qaşında müjgan oxun mənimçün.*
*Kafər gözünə, ya rəb, mən netdim a müsəlman.*
*Geyib qəbayi-gülgun, ey sərv-qəd salansan,*
*Qalmazdı xalq içində, çak olmadan gəriban.*
*Bir busənə həbibim can almaq eyləmiş nirx[۲].*
*Təəcil et Bəsiri kim, tez olar pəşiman.*

---

۱. س. بر بوسهٔ

۲. qiymət, dəyər

۶۳

قیامتلر ادر اول چشم و ابرو[۱]،
تعالی اللـه نه قاش و گوز اولر بو.
یوزک آینه سینه بقمقیچون،
حبابی کندویه گوز ایلمش صو.
جفانک یریدر اول زلف مکار،
بلانک عیندر اول چشم جادو.
بنی گوردکجه خلق انکله درلر،
انیس اولمش گورک مجنونه آهو.
بلا ازره بلادر عشق اچنده،
بکا هر یاکدن اول چشم و ابرو[۲].
الک دگمز **بصیری** اغلمقدن[۳]،
وار امدی گوزلرکدن الکی یو[۴].

*Qiyamətlər edər ol çeşmu-əbru,*
*Təaləllan , nə qaşu göz olur bu.*
*Üzün ayinəsinə baqmaq üçün.*
*Hübabı kəndüyə göz eyləmiş su.*
*Cəfanın yeridir ol zülfi-məkkar,*
*Bəlanın eynidir ol çeşmi-cadu.*
*Məni gördükcə xalq anunla . dirlər.*
*Ənis olmuş görün Məcnuna ahu.*
*Mənə hər yandan ol çeşmu əbru.*
*Əlin dəyməz Bəsiri ağlamaqdan,*
*Var imdi gözlərindən əlini yu.*

---

[۱]. غزل استانبول ألیازما سینده یوخدور..
[۲]. نظمی مجموعه سینده بو بیت یوخدور.(۳۹۵۷)؛ پروانه ده (٥٩٦٤) بو بیت یوخدور.
[۳]. نظمی ده: پریدر اول کوزل باللـه بصیری
[٤]. نظمی: کورنممک آتونکیچون ایلمش هو؛پروانه: طور ایمدی کوزلرندن دستکی یو.

۶۴

قنده کم گوردم ایزک ای خوبلر خیلنده شاه[۱]،
ایلدم محراب و قلدم اول مقامی سجده‌گاه.
اول هلال ابرو کمانی شکلیدر قولمده نعل،
تیر و تیغی زخمی در سینمده اولن شکل آه.
یار دردندن کوکل دیوانه و شیدا اولب،
هرگون آه اتدکیچون اندن صورلمز هر گناه.
پادشاهم قولکم جوریله کوکلم یقمه کم،
مملکت ویران اولر ظالم اولرسه پادشاه.
ماه اویکنمز جمالک شمعنه یوز وجهله،
آفتاب اولمز مشابه یوزکه بی اشتباه.
دفتر اعمالکی پاک استریسک ای کوکل،
ایله دفتردار درگاهینی هرگون سجده گاه.
آفتاب مکرمت اسکندر اول بی مثل کم،
سایه لطفی اولپدر حاجت اهلنه پناه.

*Qanda kim, gördüm izin, ey xublar xeylində şah,*
*Eylədim mehrab u qıldım ol məqami səcdəgah.*
*Ol hilal əbru kamanı şəklidir qolumda nəəl,*
*Tiru tiği zəxmidir sinəmdə olan şəkli-ah.*
*Yar dərdindən könül divanə vu şeyda olub,*
*Hər gün ah etdikiçün ondan sorulmaz hər gunah.*
*Padişahım qulunam cövrilə könlüm yaxma kim,*
*Məmləkət viran olar, zalim olursa padişah.*
*Mah öykünməz camalın şəminə yüz vəchilə,*
*Aftab olmaz müşabih üzünə bi-iştibah.*
*Dəftəri-əmalını pak istərisən, ey könül,*
*Eylə dəftərdar dərgahını hər gün səcdəgah.*
*Aftabi-mükrəmət İskəndər, ol bimisl kim,*
*Sayeyi-lütfi olubdur hacət əhlinə pənah.*

---

[۱]. غزل استانبول ألیازما سینده یوخدور.

۶۵

لیلی زلفکدن اولالی بو سودالر بزه،
اویدلر مجنون کبی آهوی صحرالر بزه.
ناله ایدر[۱] هر نفس طاغلر فعانم ایشدوب،
کف موجیله دوگونر جمله دریالر بزه
دوشده گوردم زلفکی اولدم پریشان عاقبت،
گور نه تاثیر ایلدی آخر بو رویالر بزه.
یوزن اُرتر بندن اول ماهک بو زلف عنبرین،
نه قراگون اولدی اول زلف سمن سالر بزه.
فتنه دن فارغ یوررکن ای **بصیری** آه کم،
باشلدی باشدن عتاب اول چشم شهلالر بزه.

*Leyli zülfündən olalı bu sevdalar bizə,*
*Uydular Məcnun kimi ahuyi-səhralar bizə.*
*Nalə edər hər nəfəs dağlar fəğanım eşidib,*
*Kəffi-mövcilə döyünər cümlə dəryalar bizə.*
*Duşda gördüm zülfüni oldum pərişan aqibət,*
*Gör nə təsir eylədi axir bu röyalar bizə.*
*Üzün örtər məndən ol mahın bu zülfi-ənbərin,*
*Nə qaragün oldı ol zülfi-səmənsalar bizə.*
*Fitnədən fariq yürürkən, ey Bəsiri, ah kim,*
*Başladı başdan itab[2] ol çeşmi-şəhlalar bizə.*

[۱]. س.: قلور – ناله قلور هر تفس

[۲]. özünü danama

۶۶

هم نفس اوللی جان ناله و افغانلر اله،
موم در ینمغه دل شمع شبستانلر اله.
سر و سامان ندرر کنج خراباتده کم،
خوشدرر صحبتمز بی‌سر و سامانلر اله.
بز سمن چهره‌لرک حدله خطن گورالوم،
باغبان اگلنی دورر[۱] شو کل و ریحانلر اله.
جملۀ خلق جهان دردنه درمان استر،
بز خدادن دلرزار دردنی[۲] درمانلر ایله.
سن صالن نازله بز دیده و دل درجن آچوب،
اولمکه در[۳] صاچلوم یولکه دامانلر اله[۴].
ای **بصیری** ندرز داخی سلامت یقه سن،
چون ملامت یوررز چاک گریبانلر اله.

*Həmnəfəs olalı can nalə vu əfğanlər ilə,*
*Mumdur yanmağa dil şəmi-şəbistanlar ilə.*
*Səro saman nədurur künci-xərabatda kim,*
*Xoşdurur söhbətimiz bisəro samanlar ilə.*
*Biz səmən çöhrələrin hədilə xəttin görəlim,*
*Bağban əyləni durur şu gül u reyhanlar ilə.*
*Cümləyi-xalqi-cahan dərdinə dərman istər,*
*Biz xudadan diləriz dərdini dərmanlər ilə.*
*Sən salan naz ilə, biz didə vu dil durcun[5] açıb,*
*Ölməyədir saçalım yoluna damənlər ilə.*
*Ey Bəsiri, nedəriz daxı səlamət yaxasın,*
*Çün məlamət yürürüz çaki-gəribanlar ilə.*

---

۱. س. دورسون کل ؛ نظمی: تورسون کل
۲. س. دیلروز درد بی درمانلر ایله؛ نظمی دیلروز دردنی؛ پروانه: بز خدادن دیلروز
۳. سو لعل ایله در صاچلوم یولکه درمانلر ایله
۴. پروانه مجموعه سینده (۶۰۳۶) بو بیت یوخدور.

۵. *kiçik sandıqça*

۶۷

همدم کمونله اولوردم گر نی اولمسه[1]،
کوکلوم نیله اکلنوردی می اولمسه.
هجر اولمسه وصال ده اولمزدی غالبا،
اولورمدی بهار جهانده دی اولمسه.
کوینه وارمسم بکا درلک محالدور،
مجنون اولوردی سیرگهی گر هی اولمسه.
بغری دلندی گاه فغان و دخی نفیر،
نیدی بو دنلو ناله اگر دل نی اولمسه.
حسنونک کتابنی ایدندی **بصیری** شرح،
تومار عمر بر نیچه مدت طی اولمسه.

*Həmdəm kiminlə olurdum gər ney olmasa,*
*Könlüm nə ilə əylənirdi, mey olmasa.*
*Hicr olmasa, visal da olmazidi ğaliba,*
*Olur midi bahar, cahanda Dey olmasa.*
*Kuyinə varmasam, mənə dirilik mühaldır.*
*Məcnun olurdı seyrgəhi , gər hey olmasa.*
*Bağrı dəlindi gah fəğanu daxı nəfir,*
*Nə idi ? bu dənlü nalə əgər dil ney olmasa.*
*Hüsnün kitabını edindi, Bəsiri şərh,*
*Tumari-ömr bir neçə müddət tey olmasa.*

---

[1]. غزل تهران آلیازماسیندا یوخدور

۶۹

غم هجرکده ایشم ناله و اه[۱]،
ندایم کمسه یوق حالمدن آگاه.
بکا در عشقدن قل توبه زاهد،
نجه سی توبه در استغفراللـه.
منجم خالـله زلفک گورن در،
طلودر فتنه سیله آه بو ماه.
عدم یولنده یولداشم غمک در،
سفر مشکلدر اولماینجه همراه.
**بصیری** زارلقدن نسنه بتمز،
مکر بر ایش ادر آه سحرگاه.

*Ğəmi-hicrində işim nalə vu ah,*
*Nedəyim, kimsə yox halımdan agah.*
*Mənə der eşqidən qıl tövbə, zahid.*
*Necəsi tövbədir: əstəğfirallah,*
*Münəccim xal ilə zülfün görən, der,*
*Doludur fitnəsilə , ah, bu mah.*
*Ədəm yolunda yoldaşım ğəmindir,*
*Səfər müşkildurur olmayınca həmrah.*
*Bəsiri, zarlıqdan nəsnə bitməz,*
*Məgər bir iş edər ? ahi-səhərgah.*

---

[۱]. س. بو غزل یوخدور.

*Ol iki məxmur[1] gözlər arizi-dildarda,*

*İki nərgisdir açılmış guşeyi-gülzarda.*

*Çəkmə zəhmət, ey bizim viranəmizdə gül tikən,*

*Kim, bu möhnətxanədə gül daxı bitməz xardə.*

*Bulduq ey Türki-Xətayi hər qılında zülfünün,*
*Hər nə keyfiyyət ki, qonmuş nafeyi-Tatarda[2].*

*Baş qaldırmaz gözün naz uyxusundan bir nəfəs,*
*Gərçi dirlər:xab olmaz mərdumi-bimarda[3].*

*Ənbərin müşkin məgər zülfündən oğurladı bu,*

*Kim, üzündən qaralıb gəzdirdilər bazarda.*

*Bir nəzərdə gərçi yüz can alır ol gözlər, vəli,*
*Hər nəfəs yüz can bağışlar ləblərin guftarda[4].*

*Dildə bitmiş can kibi xətti-xiyalı-dilbərin.*
*Ey Bəsiri, gərçi dirlər səbzə bitməz narda[5].*

---

[1] . xumar , arizi-didarI üz, camal
[2] .Tatar müşki ki, məşhurdur
[3] . ZərbiməsəldirI xəstə göxünə yuxu gəlməz
[4] . danışanda
[5] .ZərbiməsəkdirI odda butgi bitməz.

۶۹

اول ایکی مخمور[۱] گوزلر عارض دلدارده،

ایکی نرکسدر اچلمش کوشهٔ کلزارده.

چکمه زحمت ای بزم ویرانمز ده کل دکن،

کم بو محنت خانه ده کل داخی بتمز خارده[۲].

بولدق[۳] ای ترک خطایی هر قلنده زلفکک،

هر نه کیفییت که قونمش نافهٔ تاتارده.

باش قلدرمز کوزک ناز اویقوسندن بر نفس،

کرچه درلر خواب اولمز مردم بیمارده.

عنبرک مشکین مکر زلفکدن اوغرلادی بو[۴]،

کم یوزندن قارالیوب کزدردلر بازارده[۵].

بر نظرده کرچه یوز[۶] جان الور اول کوزلر ولی،

هر نفس یوز جان بغشلر لبلرک کفتارده[۷].

دلده بتمش جان بکی خطی خیالی دلبرک،

ای **بصیری** کرچه درلر سبزه بتمز نارده[۸].

---

۱. س. سرمست

۲. پروانه ده بو بیت یوخدور.

۳. س. بولدم

۴. نظمی: عنبر مشکین مکر زلفکدن اوغرولادی بو؛ پروانه ده (۶۳۶۳) بو بیت یوخدور

۵. س. بو بیت یوخدور؛ پروانه ده (۶۳۶۳) بو بیت یوخدور.

۶. نظمی: بک

۷. بو بیت سلیمانیه ألیازما سینده یوخدور.

۸. نظمی: ای بصیری کرچه هرکز سبزه بتمز نارده

۷۰

بسترم طپراغ و بالین طاشدر ویرانه ده[۱]،
آه کم دگلنمدم هرکز بو محنت خانه ده.
باده نوش اولن کشی نیلر نگین و خاتمی،
کم نگین لعلدر اکه قدح میخانه ده.
بر عجایب حاله اوغرادم بو بن بیچاره کم،
عاقل اغلر حالمه دردکدن و دیوانه ده.
قصر زرگار اچره مجنون گرسه گر غمگین اولر،
بو عجایب حالدر کم شادی اولر ویرانه ده.
ای **بصیری** عکس چشم رند درد آشام در،
هر حباب باده کم دشمشدرر پیمانه ده.

*Bəstərim toprağu balin[2] daşdır viranədə,*
*Ah kim, dinlənmədim həgiz bu möhnətxanədə.*
*Badə nuş olan kişi neylər neginu xatəmi,*
*Kim, negini-ləldir ana qədəh meyxanədə.*
*Bir əcaib hala uğradım bu mən biçarə kim,*
*Aqil ağlar halıma dərdindənu divanə də.*
*Qəsri-zərkar[3] içrə Məcnun girsə gər, ğəmgin olar,*
*Bu əcaib haldır kim, şadi olar viranədə.*
*Ey Bəsiri, əksi-çeşmi-rind dərd aşamdır,*
*Hər hübabi-badə kim, düşmüşdurur peymanədə.*

[۱]. بو غزل استانبول ألیازما سینده یوخدور.

[۲]. yatmaq yeri, döşək
[۳]. qızıl ilə bəzənmiş

۷۱

بکا نزاکت[۱] حسنک بر بوسه قل روانه،
خیر ات بگون کومکی سن بن بر ناتوانه.
پروانه اولمق ایستر دل مجلسنده تا کم،
سوز درون دیه سن شمعه یانه یانه.
جور و ستمده دعوت اتدی سنونکله اما،
گوردی که باشه چقماز اویدی سکا زمانه.
یانمش ضعیف جسمم ایتلره ویرنک چونکم،
میل ایلمز بلورسن سگ یانمش استخوانه.
مطرب ترانه یی قو کم بزم غمده هر دم،
دیوانه های و هویی یتر بکا ترانه .
تعلیم خانه اولدی سینک سنن **بصیری**،[۲]
اوستندکی دوگونلر جور اوقنه نشانه.

*Mana nizakəti-hüsnün bir busə qıl rəvanə,*
*Xeyr et bugün göməyi sən, mən bir natavanə.*
*Pərvanə olmaq istər dil məclisində ta kim,*
*Suzi-dərun diyəsən şəmə yanə-yanə.*
*Cövru sitəmdə dəvət etdi səninlə, amm,*
*Gördi ki, başa çıxmaz, uydı sana zəmanə.*
*Yanmış zəif çismim, itlərə verin çünkim,*
*Meyl eyləməz bilirsən, səg yanmış üstuxanə.*
*Mütrib, təranəyi qoy kim, bəzmiğəmdə hər dəm,*
*Divanə hayu huyi yetər mana təranə.*
*Təlimxanə oldı sinən sənin, Bəsiri,*
*Üstündəki düyünlər cövr oxuna nişanə.*

---

[۱]. س. ذکات حسنک
[۲]. تهران آلیازماسیندا غزلین قاباغکی بیتلری یوخدور.

۷۲

بیک ادم جمع اولور گلشنده شمدی بر قابق اوزره[۱]،
که زیرا موسم گلدر جهان جمله اياق اوزره.
فراموش ایلیب غم خانه قایدک عزم باغ ایله،
قورب بزم بساط عیشی گلشنده فراق اوزره.
سرشک ال اقتمش یاد ایدب فرهادی مسکینی،
گورنلر ژاله صانمش لالۀ روشن چراغ اوزره.
کچوب بکزی کسلمش رشک رخسارونله گلشنده،
خجالت دوشدی واریسه گل و نسرینک باغ اوزره.
**بصیری** کچدی عمری گرچه بر طاغ ایله فرهادنک،
بنی سیر ایله که قویدم تنمده داغی داغ اوزره.

*Bin adəm cəəm olur gülşəndə şimdi bir qabağ üzrə,*
*Ki, zira mövsimi-güldür cahan cümlə ayaq üzrə.*
*Fəramuş eyləyib ğəm xanə qaydın əzmi-bağ ilə,*
*Qurub bəzmi-bəsati-eyşi gülşəndə fəraq üzrə.*
*Sirişki[2] al axıtmış, yad edib Fərhadi-miskini,*
*Görənlər jalə sanmış, laleyi-rövşən çiraq üzrə.*
*Keçib, bənzi kəsikmiş rəşki-ruxsarınla gülşəndə,*
*Xəcalət düşdi, var isə gülu nəsrinin bağ üzrə.*
*Bəsiri keçdi ömri, gərçi bir dağ ilə Fərhadın,*
*Məni seyr eylə ki, qoydum tənimdə dağı dağ üzrə.*

---

۱. غزل تهران و استانبول أليازما لرينده يوخدور "مجموعه المعارف"-دن۹۹ آلينيبدير.
۲. göz yaşı

۷۳

طوبیی روا که قدنکه کمتر غلام اوله[۱]،
جائز فلکده کندونکه قایمقام اوله.
شها سمندر رفعته اولدقجه سن سوار،
سر رشته مرامنک النده ضمان اوله.
ای گوزلری حرامی حلال اولمیه ساکا،
بنسز شراب نابی ایچرسک حرام اوله.
اول ماه خنجروکله اوزن بر تورترسه گر،
ایشی بر اکی گونده هلالنک تمام اوله.
سیر ایتدوررسه زلفک آلدانمه ای کوکل،
شهباز دل شکارنه شاید که دام اوله.
خوشدر **بصیری** گل کبی گلشنده دلبروک،
هر دم الینده جام می لاله فام اوله.

*Tubaya rəva ki, qəddinə kəmtər ğulam ola,*
*Caiz fələkdə kəndinə qayimməqam ola.*
*Şəha səməndəri[2]-rüfətə olduğca sən suvar,*
*Sərriştəyi[3]-məramın əlində zəman[4] ola.*
*Ey gözləri hərami həlal olmaya sana,*
*Mənsiz şərabi-nab içərsən həram ola.*
*Ol məh xəncərinlə özün bir tutatsa, gər,*
*İşi bir-iki gündə həlalın tamam ola.*
*Seyr etdirirsə zülfünü aldanma, ey könül,*
*Şəhbazi-dil şikarına şayəd ki, dam ola.*
*Xoşdur , Bəsiri, gül kimi hülşəndə dilbərin,*
*Hər dəm əlində cami-meyi-laləfam ola.*

---

[۱]. غزل تهران و استانبول أليازما لرينده يوخدور "مجموعه المعارف"-دن ۱۰۷ آلينيبدير
[۲] . at
[۳] . əsas, ipin ucu
[٤] . zəmanət, boynuna

۷۴

وصلکیله طالعم بر لحظه فیروز اولمدی،
گلدِ نوروز و شب هجرانمز روز اولمدی.
هر کشی عیش و طربده بن غم و اندوه ده،
خلقه نوروز اولدی اما باکه نوروز اولمدی.
چکدلر شام غمکده آه عاشقلر ولی،
شعلۀ آهم بکی بیری شب افروز اولمدی.
دیده گریانم اول چابک سواری گوریجک،
اولقدر اغلادی میداننده کم توز اولمدی.
بزم محنتده **بصیری** آه آتش بارله،
شمع کیبی شکر کم بر لحظه پی‌سوز اولمدی.

*Vəslinilə taleim bir ləhzə firuz olmadı,*
*Gəli Novruz u şəbi-hicranımız ruz olmadı.*
*Hər kişi eyşu tərəbdə, bən ğəmu ənduhda,*
*Xalqa novruz oldı, amma bana novruz olmadı.*
*Çəkdilər şami-ğəmində ah aşiqlər, vəli,*
*Şöleyi-ahım kibi, biri şəbəfruz olmadı.*
*Dideyi-giryanım ol çabuk-suvarı göricək,*
*Ol qədər ağladı, meydanda kim, toz olmadı.*
*Bəzmi-mühnətdə, Bəsiri, ahi-atəş barilə,*
*Şəm kibi şükr kim, bir ləhzə pisuz[۱] olmadı.*

---

۱ . yaq ilə yanan çıraq

۷۵

خالی اولمز درد و محنتدن بو کوکلم مسکنی،
تکری گویا کم بلایچون یرتمشدر بنی.
خانه درد و بلادر عشق شهرنده تنم،
گوزلرم هر یاکدن اولمشدر انک روزنی[1].
سینۀ سوزانم ایچنده وطن دوتن[2] کوکل،
بکزر اول دیوانیه کم مسکن اتمش[3] گلخنی.
زخمنی شمشیرکک دکمک دلر دل دوستم،
کاتش آهمله[4] پیکانکدن اتمش سوزنی[5].
روز عمرم ای **بصیری**[6] آه و وایله کچر،
روزگارم گر بونک کبی کچرسه وا بنی.

*Xali olçaz dərdu möhnətdən bu könlüm məskəni.*
*Tanrı guya kim, bəla üçün yaratmışdır məni.*
*Xaneyi-dərdu bəladır eşq şəhrində tənim,*
*Gözlərim hər yandan olmuşdur anın rövzəni.*
*Sineyi-suzanım içində vətən tutan könül,*
*Bənzər ol divanəyə kim, məskən etmiş külxəni*
*Zəxmini şəmşirinin tikmək dilər dil , dostum,*
*Katəşi ahim ilə peykandan etmiş suzəni.*
*Ruzi ömrüm, ey Bəsiri, ahu vay ilə keçər,*
*Ruzigarım gər bunun kimi keçərsə , va bəni.*

---

[1]. نظمی: کم کوزوم هر یاکدن ؛ پروانه (۷۸۰٦) کم کوزوم
[2]. نظمی: دوتدی ؛ پروانه: قرار اتدی
[3]. نظمی: اتدی
[4]. س. آهیله
[5]. نظمی: بو بیت یوخدور
[6]. س. ای بصیری روز عمرم؛ نظمی: ای بصیری روز عمرم؛ پروانه: ای بصیری روز

۷۶

گورمدک آه یوزی لاله مزی،
دلبر عنبرین کلاله مزی.
ایچمزز شیشهٔ فلکدن می،
گر هلال[۱] ایلسه پیاله مزی.
دعوی قان ادر کوکل بوگون،
بر گوزل قول ایدک حواله مزی.
اول صنم زیر و بم ترانه صانور،
ایشدرسه فغان و ناله مزی.
ای **بصیری** او قاره یوزلو رقیب،
آلله الدی گوزی آله مزی.

*Görmədin ah üzi laləmizi,*
*Dilbəri-ənbərin külaləmizi[2].*
*İçməziz şişeyi-fələkdən mey,*
*Gər həlal eyləsə piyaləmizi.*
*Dəviyi-qan edər könül bugün,*
*Bir gözəl qovl[3] edin həvaləmizi.*
*Ol sənəm ziru  bəmi-tərənə sanır,*
*Eşitdirsə fəğanu naləmizi.*
*Ey Bəsiri, o qara üzlü rəqib,*
*Al ilə aldı gözi alamızı.*

[۱]. س. ملال// بو سؤز حلال اولمالیدر

[۲]. baş saçı, qıvrım saç
[۳]. söz , vədə

۷۷

اتمگل جور و جفا باکه صاتلمش چلبی[۱]،
بوینی بغلو قول اولم ساکه صاتلمش چلبی.
عاشقن اولدریجک بن دخی اندن دلرم،
اولدم ایچنده بنی اکه صاتلمش چلبی.
سرو آزاده دلارا اکن ای تازه نهال،
قول در قد دلاراکه صاتلمش چلبی.
طوغری بو کم یوقرو نیجه باقم شرممدن،
سرو درسم قد و بالاکه صاتلمش چلبی.
ای **بصیری** اگر اول ماه دکلسه یوسف،
بس نه یوزدن دیدلر اکه صاتلمش چلبی.

*Etməgil cövru cəfa mana satılmış çələbi,*
*Boynı-bağlı qul olam sana satılmış çələbi.*
*Aşiqin öldüricək mən daxı ondan dilərəm,*
*Ol dəm içində bəni ana satılmış çələbi.*
*Sərvi azadə dilara ikən , ey tazə nəhal,*
*Quldur qəddi-dilarana satılmış çələbi.*
*Doğru bu kim, yuxarı necə baxım şərmimdən,*
*Sərv dirsəm qədu balana atılmış çələbi.*
*Ey Bəsiri, əgər ol mah dəyilsə Yusif,*
*Bəs nə üzdən dedilər ana satılmış çələbi.*

---

[۱]. بو غزل استانبول آلیازما سینده یوخدور.

۷۸

اول شکر لب کم توکر تنگ شکر هر خنده سی[۱]،
بر اغز صورمغمه هرگز بولمدق[۲] شرمنده سی.
یوز گل شادی اچر جان گلشننده بر نفس،
گریه عشاقه اول غنچه دهانک خنده سی.
بنده لر آزادلق استر خدادن لیک بن،
استرم اول سرو آزادک کم اولم بنده سی.
اول شکر لب لعلنه روح مجرد گر دسم،
یوق عجب کم اول خضریله مسیحا زنده سی.
ای **بصیری** خلعت شاهیه باش اندرمزم،
اگنمه زیبا گلندن پرلو عشقنک ژنده سی.

*Ol şəkərləb kim, tökər tungi-şəkər hər xəndəsi,*
*Bir ağız sormağa hərgiz bolmadıq şərməndəsi.*
*Yüz güli-şadi açar can gülşənində bir nəfəs,*
*Giryeyi-uşşaqa ol ğönçə dəhanın xəndəsi.*
*Bəndələr azadlıq istər xudadan, lik mən,*
*İstərəm ol sərvi-azadın kim, olam bəndəsi.*
*Ol şəkərləb ləəlinə ruhi-mücərrəd gər desəm,*
*Yox əcəb kim, ol Xizrilə Məsiha zindəsi.*
*Ey Bəsiri, xələti-şahiyə baş endirməzəm,*
*Əynimə ziba gülündən birlü eşqin jindəsi.*

---

۱. بو غزل استانبول ألیازما سینده یوخدور.
۲. اولمادیق – جغتای لهجه سینده دیر

۷۹

آغرسه گوکه شعلۀ آهم شراره سی[۱]،
هر بر شزازسی اوله چرخک ستاره سی.
هر بحره بر کنار مقرر درر ولی،
بر بحردر گوزم کم انک یوق کناره سی.
احوالمه قان اغلیجی دیده لر درر،
جسممده هر طرف اچلن اوقی یاره سی.
اول رویه نیجه وصف اوله کم مهر و ماهدن،
یوز وجهله یک اوله انک بر نظاره سی.
صبر ایلمه ای **بصیری** انک یاره سینه کم،
خلعت درر سکا چگرک پاره پاره سی.

*Ağrısa göyə şöleyi-ahım şərarəsi,*
*Hər bir şərarəsi ola çərxin sitarəsi[2].*
*Hər bəhrə bir kənar[3] müqərrər durur, vəli,*
*Bir bəhrdir gözüm kim, onun yox kənarəsi.*
*Əhvalıma qan ağlayıcı didələr durur,*
*Cesmimdə hər tərəf açılan oxı, yarəsi.*
*Ol ruya necə vəsf ola kim, Mehru Mahdan,*
*Yüz vəch ilə yey ola onun bir nəzarəsi.*
*Səbr eyləmə, ey Bəsiri, onun yarasına kim,*
*Xələt durur sana ciyərin parə-parəsi.*

---

۱. بو غزل استانبول أليازما سینده یوخدور.

۲. ulduzu
۳. sahil

۸۰

عاشق زار گورسه گل یوزنی[1]،
خالی کیبی اوده اته اوزنی.
شبمز صبحی یوقدرر صانه سن،
کجمز یاد قلدی کندزنی.
باش اندرمزم نباته دخی،
ایشدلدن انک شکر سوزنی.
ترک اتمم خیالی خالینی،
ورسه گر شاه هند هر سزنی.
ای **بصیری** بصیرت اهلیسک،
بو گوزی اورتوب آچ کوکل گوزنی.

*Aşiqi-zar görsə gül üzüni,*
*Xalı kimi oda ata özüni.*
*Şəbimiz[2] sübhi yoxdurur sanasan,*
*Gecməz, yad qıldı kəndözini.*
*Baş endirməzəm nəbata daxı,*
*Eşidildən onun şəkər sözüni.*
*Tərk etməm xiyalı-xalını,*
*Versə gər şahi-hind hər sözini.*
*Ey Bəsiri, bəsirət əhlisən,*
*Bu gözi örtüb, aç könül gözüni.*

---

[1]. بو غزل استانبول آلیازما سینده یوخدور.

[2]. gecəmiz

۸۱

بو مقرر که جهانده هر ایشک وار اهلی،
عشق اهلن صورریسک بنم ای یار اهلی.
سینه سن کف ترازو کبی طاشلرله دوکر،
گورسه ای یوسف مصری سنی بازار اهلی،
عاری بر یاکه قویب عشقنکه اویدم صنما،
یعنی کم عاشق شیدا اولیمز خار[۱] اهلی.
گوردلر[۲] آتش آهم شررن محشرده،
طامونک اودینه ایسندی قمو نار اهلی
ای **بصیری** گوریجک زلفنه طولشدوغکی،
بغلیه خدمتکه بیل قمو زنار اهلی.

*Bu müqərər ki, cahanda hər işin var əhli,*
*Eşq əhlin sorar isən, mənəm ey yar, əhli.*
*Sinəsin kəffi-tərazu kimi daşlarla döyər,*
*Görsə ey Yusifi-Misri səni bazar əhli.*
*Arı bir yana qoyub, eşqinə uydum sənəma,*
*Yəni kim, aşiqi-şeyda olamaz xar əhli.*
*Gördülər atəşi-ahım şərərin məhşərdə,*
*Damunun oduna isindi qamu nar əhli.*
*Ey Bəsiri, göricək zülfünə dolaşduğuni,*
*Bağlaya xidmətinə bel, qamu zunnar əhli.*

---

[۱]. س. عار؛ نظمی: عار ؛ پروانه (۷۹٤۷) عار
[۲]. س. کورسه لر ؛ پروانه: کورسه لر

۸۲

بزمله ایشوک جفا افندی[۱]،
آدم می دوکر بو نه افندی.
سن بکا نه دنلو[۲] کم سوکرسک،
بن سکا قلام دعا افندی.
سندن نیجه سی وفا اومه دل،
چون عمرده یق وفا افندی.
اقبال ورور‌دی ال گر اتسم،
سن سروله مرحبا افندی.
رحم ایله **بصیری** قولکه کم،
اولدی سکا مبتلا افندی.

*Bizimlə işin cəfa, əfəndi,*
*Adammı döyər bu nə əfəndi ?*
*Sən bana nə dənlü kim, söyərsən,*
*Mən sana qılam dua , əfəndi.*
*Səndən necəsi vəfa uma dil ?*
*Çün ömürdə yox vəfa əfəndi.*
*İqbal verirdi əl , gər etsəm,*
*Sən sərv ilə mərhəba əfəndi.*
*Rəhm eylə, Bəsiri, quluna kim,*
*Oldı sana mübtəla əfəndi.*

---

[۱]. تهران أليازما سينده بو غزل يوخدور.
[۲]. هر نه تهر ، هر نئجه

۸۳

گوردی شمع اویکنه لی قدینه مذموم اولدی[۱]،
قودی سرکش‌لکنی خدمتنه موم اولدی.
قامت جلوه‌گرک لشکر عشاق ایچره،
علم حسن و بهادر دیو معلوم اولدی.
ماهی شمع ایله گزوب بلمادی کوینده سنی،
یاندی یقیلدی غمنله گیجه مه موم اولدی.
شرح ایدر ذره قدر سر دهانک یوقدر،
شمدی ارباب سخن واریسه معدوم اولدی.
وصف دندانونک ایله شعر **بصیری** جانا،
در مکنون ایله بر جوهر منظوم اولدی.

*Gördi şəm öykənəli qəddinə məzmim[2] oldı,*
*Qoydı sərkeşliyini[3] xidmətinə mum oldı.*
*Qaməti-cilvəgərin ləşkəri-uşşaq içrə,*
*Ələmi-hüsnu bəhadır , deyü, məlum oldı.*
*Mahı şəəm ilə gəzib, bulmadı kuyində səni,*
*Yandı, yaxdı ğəmin ilə gecə mah mum oldı.*
*Şərh edər zərrə qədər sirri-dəhanın yoxdur,*
*Şimdi ərbabi-süxən var isə, çəədum oldı.*
*Vəsfi-dəndanın ilə şeiri , Bəsiri, cana,*
*Dürri-məknun ilə bir cövhəri-mənzum oldı.*

---

۱. غزل تهران و استانبول ألیازما لرینده یوخدور "مجموعه المعارف"-دن ۱۱۷ آلینیبدیر
۲. danlanmış
۳. söz qulaq asmayan, itaətsiz

۸۴

دل دام سر زلف پریشانونه دوشدی[۱]،
اما که کوکل چاه زنخدانونه دوشدی.
جان حقه ایله لعل لب مرجاننک ارارکن،
سر رشته دل جوهر دندانینه دوشدی.
دل خسته لری طعم شمشیرنک ایدنده،
دل تشنه لروک خنجر برانونه دوشدی.
تن خاکی ره کویک افتاده‌سی اولدی،
آواره کوکل حاصلی دامانه دوشدی.
بیجاره **بصیریی** هلاک اتمگه جانا،
خنجر کبی اعدا دخی هب یاننه دوشدی.

*Dil dami-səri-zülfi-pərişanına düşdi,*
*Amma ki, könül çahi-zənəxdanına düşdi.*
*Can huqqə ilə ləli-ləbi mərcanın ararkən,*
*Sər-riştəyi-dil cönhəri-dəndanına düşdi.*
*Dil xəstələri təəmi-şəmşirinin edəndə,*
*Dil tişnələrin xəncəri-burranına düşdi.*
*Təni-xaki rəhi-kuyun üftadəsi oldı,*
*Avara könül hasili damanına düşdi.*
*Biçarə Bəsiriyi həlak etməyə cana,*
*Xəncər kimi əəda[2] daxı həb yanına düşdi.*

---

[۱]. تهران و استانبول آلیازما لرینده یوخدور "مجموعه المعارف"-دن ۱۱۷ آلینیبدیر
[۲] . düşmanlar

۸۵

دل شیدا کبی بزم بلا جامنک چکر وار می[1]،
بو بن رسوا کبی بر خاکه د.شمش بیخبر وار می.
گزر یردن یره کوینده سرگردان اولب هر شب،
غمنله بدر انور کبی شمدی دربدر وارمی.
رقیب اولدرمکه دربند غمده یول یراغیچون،
عجب تیغ و تبر کبی سلاح معتبر وارمی.
طولاشر یاننی یاروک بلنک قجمق ایچون عالم،
کمردن غیری اما اول میانی بر قوجر وارمی.
دوکوب اشگ فراوانی یولنده بذل ایدر وارک،
گل انصاف ات **بصیری** کبی بر صاحب نظر وارمی.

*Dili-şeyda kimi bəzmi-bəla camın çəkər varmı ?*
*Bu mən rusva kimi bir xaka düşmüş bixəbər varmı ?*
*Gəzər yerdən yerə kuyində sərgərdan olub hər şəb,*
*Ğəminlə bədr ənvər kimi şimdi dərbədər varmı?*
*Rəqib öldürməyə dərbəndi-ğəmdə yol yarağiçün,*
*Əcəb tiğu təbər kimi silahi-mötəbər varmı?*
*Dolaşır yanını, yarın belin qucmaq üçün aləm,*
*Kəmərdən qeyri amma ol miyanı bir qucar narmı?*
*Töküb əşki-fəravani yolunda bəzl edər varın,*
*Gəl insaf et Bəsiri kimi bir sahib-nəzər varmı?*

[1]. غزل تهران و استانبول آلیازما لرینده یوخدور "مجموعه المعارف"-دن ۱۱۹ آلینیبدیر

۸۶

جورونله سنوک خاطر محزون سقلدی[1]،
گوز یاشی دوکوب دیده پرخون سقلدی.
یاد لب لعلنله سنوک میکده‌لرده،
آللاه که ینه باده گلگون سقلدی.
مستانه چکوب سینمه قجدوکجه میانوک،
تر دوشدی براز اول قد موزون سقلدی.
تاج زر ایله سلطنتوک دردسریندن،
ای دل نیجه جمشید و فریدن سقلدی.
میدانه چیقوب مکتبه وارنجه **بصیری،**
خیلیجه بو ابیات ایله مضمون سقلدی.

*Cövrünlə sənin xatiri-məhzunun sıxıldı,*
*Göz yaşı töküb, dideyi-purxunı sıxıldı.*
*Yadi-ləbi-ləlinə sənin meykədələrdə,*
*Allah ki, yinə badeyi-gülgünə sıxıldı.*
*Məstanə çəkib sinəmə qucdunca miyanın,*
*Tər düşdi bir az, ol qədi movzunı sıxıldı.*
*Taci-zər ilə səltənətin dərdsərindən,*
*Ey dil, neçə Cəmşidu Firiduni sıxıldı.*
*Meydana çıxıb məktəbə varınca, Bəsiri,*
*Xeylicə bu əbyat ilə məzmuni sıxıldı.*

---

[1]. تهران و استانبول أليازما لرينده يوخدور. "مجموعه المعارف"-دن ۱۱۷ آلينيبدير.

## سلطان سلیم قصیده سی

لشکرکهدرر فلک انجم سکا سپاه،
مه بر قولکدرر گیر التونلو شب کلاه.

*Ləşkərgəhindir fələk əncumi sənə sipah,*
*Məh bir qulundur, geyər  altınlı şəbkulah.*

طاق سرایک ازره گنش جام زر نگار،
اوردویی قدرک اچره[1] فلک کحلی بارگاه.

*Tağı-sarayın üzrə günəş cami-zərnigar,*
*Orduyı qədrin içrə fələk kəhli bargah.*

گروبیلر چقاره کوکک ایکی کوزی[2]،
گر مهر گوزیله سکا اتمیه نگاه.

*Kərubilər çıxara kökün iki gözi,*
*Gər mehr gözilə sana etməyə nigah.*

چرخ ازره گورنن گجه لر کهکشان[3]،
گردون سراکی سیر ایداین دیو قلد راه.

*Çərx üzrə görünən gecələr kəhkəşan.*
*Gərdun saranı seyr edəyin deyü qıldı rah.*

مدحکده ایکن اوقودی بر دردمند عشق،
بو مطلعی و ایلدی بک درلو آه و واه.

*Mədhində inən oxudı bir dərdməndi-eşq*
*Bu mətləi vu eylədi min dürlü ahu vah.*

اولسم صچک هواسیله ای عذار ماه.

---

[1]. س. اردویی قدروک اوزره فلک
[2]. س. کوزنی
[3]. س. کهکشان دکل

شمع سیاه اولر باشم اوجنده دود آه.

*Ölsəm saçın havasilə, ey üzar-mah.*
*Şəmi-siyah olur başım ucunda dudi-ah.*

بن پادشاه مملکت درد و محنتم،
آهم لوا و طبل فغان و یاشم سپاه.

*Mən padişahi-məmləkəti dərdu möhnətəm,*
*Ahım ləva vu təbl fəğanu yaşım sipah.*

وارسم خطک غمیله اگر سبزه سیرنه،
آغولو نشتر اوله بکا هر بتن گیاه[1].

*Varsam xətin ğəmilə əyər səbzə seyrinə,*
*Ağulu nəştər ola bana hər bitən giyah.*

سومک سنی گناهسه ای سرو نازنین،
اولدر بنی که چوق بولنور بنده بو گناه.

*Sevmək səni günah isə, ey sərvi-nazənin,*
*Öldür məni ki,çox bulunur məndə bu günah.*

رحم ایله بن قولوکه اکن ظلم اتمه کم،
ناگاه واقف اوله شهنشاه دین پناه[2].

*Rəhm eylə mən quluna inən zülm etmə kim,*
*Nagah vaqif ola şəhənşahi din pənah.*

اسکندر زمانه و کیخسرو جهان،
شاه سپهر مرتبه سلطان سلیم شاه،

*İskəndəri-zəmanə vu Keyxosrovi cahan,*
*Şahi şipehr mərtəbə sultan Səlim şah.*

صادقدرر ادرسه کرم دعوسنی کم،
بو معنیه دوست[3] زرافشانی در گواه.

---

[1]. س. بو بیت یوخدور
[2]. س. شهنشاه عز و جاه
[3]. س. دو دست

*Sadiq durur edərsə kərəm dəvisini kəm,*
*Bu məniyə dosti-zərəfşanıdır guvah.*

پیکاننی اوردی زبان تیر مدحنه،
بر کز گوز اوجیله اکا ایلسه نگاه.

*Peykanını vurdı zəbani-tir mədhinə,*
*Bir kəz göz ucilə ana eyləsə nigah.*

قولادی اشکنن[۱] ونه تشبیه ایلدم،
فی الحال گرم اولب گوکه اتدی گنش کلاه.

*Qolaydı əşkinin günə təşbih eylədim,*
*Felhal kərm olub, göyə atdı günəş kulah.*

بر پادشاه چرخ مکاندر که شاهل ر،
نامن ایشتسه لر قمو (قورلر) یره جباه.

*Bir padişahi-çərx məkandır ki, şahlar,*
*Namın eşitsələr qamu qorlar yerə cəbah*[2]*.*

البرز طاغنه[۳] گذر ایلرسه لشکری،
ایلرلر آنی سم ستوریله خاک راه[۴].

*Əlburz dağına gozər eylərsə ləşkəri,*
*Edərlər anı sumi sutur ilə xaki-rah.*

ای آفتاب دولت و ای سایۀ خدای،
وی خسرو[۵] زمانه ای شاه دین پناه.

*Ey aftabi-dövlətu ey sayeyi-xuday,*
*Vey Xosrovi zəmanə, ey şahi-din,*

چشم عنایتله **بصیری** قولوکه بق،
کم حالی[۱] زلف بیکی پریشاندر و تباه.

---

۱. س. قولاروک اسکفن

۲. alın

۳. س. کوهنه ( این املا در آلیازما دستنویس بهمین شکل میباشد)
٤. س. شاه راه
٥. س. حاتم

*Çeşmi inay ət ilə Bəsiri qulana bax,*
*Kim, aləmi zülf kmi pərişandır u təbah.*

چرخک عروسی تا بنک التونلولر کیه،
تا کم اوکنده آینه لر اوله مهر و ماه.

*Çərxin ərusi ta bın altınlular geyə,*
*Ta kim, önündə aynalar ola Mehru Mah.*

عمرک لباسن اتمیه پوسیده روزگار،
دولت مگر همیشه سعادت سکا کلاه.

*Ömrün libasın etməyə pusidə ruzigar,*
*Dövlət məgər həmişə, səadət sana kulah.*

---

[1]. س. حالی

## سلطان سلیمان قصیده سی

فصل گل ایروب دماغ باغی اتدی عنبرین[۱]،
اولدی صحن کلستان رشک نگارستان چمن.

*Fəsli gül irib, dimağı bağı etdi ənbərin,*
*Oldı səhni gülüstan rəşki-nigaristani-çəmən.*

جوی کوثر سرو طولی لاله غلمان حور گل،
باغبان رضوان چمن اولمشدرر خلد برین.

*Cuyi kövsər sərv dolı, lalə, ğılman, hüru gül,*
*Bağbani rizvan çəmən olmuşdurur xüldi-bərin.*

منحنی القامه اولدوغی بنفشه طک دکل،
کم چکپدر خاک خلوت خاسنده اربعین.

*Münhəniyi-qamə olduğu bənövşə tən dəgil.*
*Kim, çəkibdir xaki-xəlnət xanəsində ərbəin.*

خضر خط سبزله آب روان اطرافنه،
سورهٔ کوثر یزر که آیت ماء معین.

*Xizr xətti-səbzilə abi-rəvan ətrafına,*
*Sureyi-Kövsər yazar ki, ayəti mai-müin.*

سرو  اولمشدر منار اوستنده بلبل در بلال،
جامع قدی چمن حافظ درر روح الامین.

*Sərv olmuşdur minar üstündə bülbüdür Bilal,*
*Camei qəddi çəmən hafiz durur ruhuləmin.*

شه نشینی نیلرز کم طرف گلشنده بو دم،
هر درختک سایه سی اولمشدرر بر شه نشین.

*Şəhnişini neyləriz kim, turfi gülşəndə bu dəm,*

---

[۱]. قصیده استانبول آلیازماسیندا یوخدور.

*Hər dirəxtin sayəsi olmuşdurur bir şəhnişin.*

بر اغزتک نوجوان غنچه گل باغه کم،

پیر اولمشدر هواکیله نهال یاسمین.

*Bir ağız tək novcəvan ğönçə gül bağa kim,*
*Pir olmuşdur havanilə nihalı-yasəmin.*

لاله لر اولمشدر گلگونه روی چمن،

هر بنفشه یبرغی اول یوزده خال عنبرین.

*Lalələr olmuşdurur gülgünə ruyi-çəmən.*
*Hər bənövşə yaprağı ol üzdə xali-ənbərin.*

نو عروس غنچه گلدن ایلمش والا تتق،

ژاله دقمش گوشه[1] هر یاکه دن در ثمین.

*Novərusi ğönçə güldən eyləmiş vala tutuq,*
*Jalə taxmış guşə hər yanadan dürri-səmin.*

قل قلم اولدی بنفشه لاجوردیله طولو،

یپرغن تحریر ایدن در غالبا گلزار ایچن.

*Qıl qələm oldı, bənövşə lacivərilə dolu,*
*Yaprağın təhrir edəndir ğaliba gülzariçin.*

اشرفی برگ گلدن صیرفی اولب صبا،

گه صیر خمسین چمن لوحنده گاهی اربعین.

*Əşrəfi bərgi-güldən seyrəfi olub səba,*
*Gəh sayır xəmsin çəmən lövhündə, gahi ərbəin.*

روضۀ رضوان دسم صادقدرر گلزاره کم،

لاله اولمش ژاله دن غلمان بکا سن سن معین.

*Rövzeyi-rizvan desəm sadiq durur gülzara kim,*
*Lalə olmuş jalədən ğılman bana sənsən müin.*

ژاله دن تسبیح بلور ایلمشدر عندلیب،

شه دعاسن اتمکه تکرار با صوت حزین.

*Jalədən təsbihi-bulur eyləmişdir əndəlib,*

---

[1]. قولاغا

*Şəh duasin etməyə təkrar ba sovti həzin.*

ظل حق سلطان سلیمان آفتاب معدلت،

اولکه عدلندن چمن اولمش قمو روی زمین.

*Zilli-həqq sultan Süleyman aftabi-mədilət,*
*Öl ki, ədlindən çəmən olmuş qamu ruyi-zəmin.*

## سلطان سلیمان قصیده سی

قدی قدرینه فلک بر جامه التونلو نبک،
یکی آی اکه گریبان کهکشاندر استین.

*.Qəddi-qədrinə fələk bir camə altınlı nəbək,*
*Yeni ay ana gəriban, kəhkəşandır astin*

خاک درگاه رفیعی توتیا اولدوغنه،
بلدلر اهل بصیرت جمله سی عین الیقین.

*Xaki-dərgahi-rəfii tutiya olduğuna,*
*Buldular əhli-bəsirət cümləsi eynul-yəqin.*

ای سپهر سلطنت وی آفتاب معدلت،
سن سن اولکم لفظ عدل اطلاق اولر ساکه معین.

*Ey sipehri-səltənət, vey aftabi-mədələt,*
*Sənsən ol kim, ləfzi-ədl itlaq olar sənə müin.*

عالم اچره چقدی چون نام شریفک عدللـه،
طکمدر اتسه سلیمان اسمکی نقش نگین. .

*Aləm içrə çıxdı çün nami-şərifin ədlilə,*
*Tənmidir etsə Süleyman ismini nəqşi-negin*

حقنکیچون خصم بدکیشله رزم اتسک شها،
گه رزم گه جوشن ایلر پرنی روح المین.

*Həqinüçün xəsmi-bədkiş ilə rəzm etşən şəha,*
*Gəh rəzm,,gəh covşən eylər pərrini ruhul-əmin.*

دست زربخشک قومادی معدن اچره هیچ سیم،
در دخی اول خوفدن اولمشدرر دریانشین.

*Dəsti-zərbəxşin qomadi mədən içrə hiç sim,*
*Der daxı ol xovfdan olmuşdurur dəryanişin*

کان یسار لعل باشکه ادر هردم قسم،

یم یمن درفشاکلمه ادر دایم یمین.

*Kən yəsar ləl başına edər hərdəm qəsəm,*
*Yəm yəmini- dürfişanlıma edər daim yəmin.*

هیچ الیشور یری یوق تیغینک مصاف خصمنده،
وجهی واردر خوفدن دوشسه سپر یوزینه جبن.

*Hiç alışır yeri yox tiğin musafi-xəsmində,*
*Vəchi vardır xufdan sipər üzünə cəbin.*

تیرکیبی دشمن بدکیش ادر هردم فرار،
دستکه السک گمان هر گوشه دن اتسک کمین.

*Tir kibi düşməni-bədkiş edər hərdəm fərar,*
*Dəstinə alsan kaman hər guşədən etsən kəmin.*

اژدر رمح قچن کم هر یکادن ارد صچا،
آتشین میل اوتورر اعدا گوزینه روزکین.

*Əjdəri-rəmh qaçan jum,hər yandan ardı saça,*
*Atəşin meyl oturur əda gözünə ruzi-kin.*

درگهکده بر غلام هندی در کیوان پیر،
مجلسکده بر منقش صحن در چرخ برین.

*Dərgəhində bir ğulami-Hindidir Keyvani-pir,*
*Məclisində bir münəqqəş səhndir çərxi-bərin.*

پرچم طوغ جلالک طرهٔ رخسار ملک،
سایه سی مهر لوالک آفتاب شرع و دین.

*Pərçəmi-tuği cəlalın türrəyi-rüxsari-mələk,*
*Sayəsi mehri-ləvanın aftabi-şəru din*

حامی شرع محمد اوللی هر مومنه،
فرضدر حمد ایلمک للـه رب العالمین.

*Hamiyi-şəri-Məhəmməd olalı hər möminə,*
*Fərzdir həmd eyləmək lillah rəbəlaləmin.*

آفرینلر ایشدب عدللی نوشیروان،
آفرین ای خسرو ملک عدالت آفرین.

*Afərinlə eşidib ədilli Novşiravan.,*

*Afərin ey xosrovi-mülki-ədalət, afərin.*

مدحک ایدرکن ادا بر مطرب نغمه سرا،
اوقودی بو شعری کم اتدی بو بن زاری انین.

*Mədhin edərkən əda bir mütribi-nəğməsəra,*
*Oxudı bu şeiri kim, etdi bu bən zari inən.*

ساکه حیران دیدهٔ عاشقدرر ای مه جبین،
هر طرفدن حلقه زلف اچره خال عنبرین.

*Sənə heyran dideyi-aşiqdurur, ey məh cəbin,*
*Hər tərəfdən həqeyi-zülf içrə xali-ənbərin.*

نقطهٔ نون قشک التندکی خال سیاه،
موج بحر حسن در ای مه جبین الکده چین.

*Nöqteyi-nuni-qaşın altındaki xali-siyah,*
*Mövci bəhri-hüsndür, ey məhcəbin alında çin.*

بزه صحن حرم در اول عنبرفشان،
لاله باغ ارم در اول عذار آتشین.

*Bizə səhni-hərəmdir ol ənbərfişan,*
*Laleyi-bağı-İrəmdir ol üzari-atəşin.*

عکس رخسارکدن اولمشدر گوزم اول آینه،
کم گورینور متصل انده جمال حور عین.

*Əksi-ruxsarından olmuşdur gözüm ol ayinə,*
*Kim, görürnür müttəsil anda camalı -hurieyn.*

ساکه بو حسن لطافت خود ازلدندر نصیب،
کمدن اوگرندک بو ناز و شیوه ای نازنین.

*Sana bu hüsnu lətafət xud əzəldəndir nəsib,*
*Kimdən öyrəndin bu nazu şivəyi , ey nazənin?*

رحم ایله ناز ایکن دخی ظلم ایلمه،
یوخسه ظلمکدن اولر واقف شه مسندنشین.

*Rəhm eylə naz inən daxı zülm eyləmə,*
*Yoxa zülmündən olar vaqif şəhi-məsnənişin.*

پادشاه بحر و بر سلطان بن سلطان گولر،
ایشگنده خسرو و خاقان غلام کمترین.

*Padişahi-bəhru bər, sultan bin sultan gülər,*
*Eşigində xosrovu xaqan, qulami-kəmtərin.*

خسروا بالـله ایشت بو قصهٔ پر غصمی،
کم نلر چکمش غم و اندوهدن جان غمین.

*Xosrov, billah eşit bu qisseyi-purqüssəmi,*
*Kim, nələr çəkmiş ğəmu ənduhdan cani-ğəmin.*

بر یکادن فقر خانه بر یکا بار عیال،
اولمسون بر کمسه نک کوکلی. (زمین)..

*Bir yanadan fəqri-xanə, bir yana bari-əyal,*
*Olmasın bir kimsənin könli zəmin.*

رحمت گوزیله باخسنک گر **بصیریدن** یانکا،
زر اولر ایشی اکرو خاکدن اولمش............

*Rəhmət gözilə baxsan gər Bəsiridən yana,*
*Zər olar işi əgər u.xakdan olmuş...*[۱]

خسرو گل..... تختنه................................
محنتنده دلربا اولدقچه..........................

*Xosrov.....taxtına......*[2]
*Möhnətdə dilruba olduqca.....*

نوبهار عمرکه ایرشمه سین باد خزان،
فتح و نصرت همچنان و بخت و دولت همنشین

*Növbahari-ömrümə irişməsin badi-xəzan,*
*Fəthu nüsrət həmçinanu bəxtu dövlət həmnişin.*

**تم الدیوان بعون الملک ادیان**
**فی اواخر شهر شعبان فی شهور سنه**
**واحدی و عشر و تسعمائه**
**۹۲۱**

---

۱ . oxunulmur
۲ . beyt əlyazmada oxunulmur.بیت اوخونولمور

ساقیا یولنه جان نقدینی کل خاک ایدلوم[1]،
غل و غشدن اریدب خاطرومز پاک ایدلوم.
عقلمز جمع ایدلم کندومز ادراک ایدلوم
مست لایعقل اولالم یقه‌لر چاک ایدلوم.

*Saqiya yoluna can nəğdini gəl xak edəlim,*
*Ğəllu ğəşdən arıdıb, xatirmiz pak edəlim.*
*Əqlimiz cəm edəlim, kəndimiz idrak edəlim.*
*Məsti-layəqəl olalım, yaxalar çak edəlim.*

اوقویب صفحه گلزارده عشرت ورقن،
گل کوکل ترک گمان ایله اولب اهل یقین.
که چمندر دل الیب فرصت فوت اتمه ساقن،
مست لایعقل اولالم یقه‌لر چاک ایدلوم.

*Oxuyub səfheyi-gülzarda, işrət varaqin,*
*Gəl könül tərki-güman ilə olub əhli-yəqin,*
*Ki, çəməndir, dil alıb, fürsəti fövt etmə, saqın,*
*Məsti-layəqəl olalım, yaxalar çak edəlim.*

کچدی بیلمزلک ایله عمر کچندن کچلوم،
شمدیدن گرو گلوک رمز رموزدن ایچلوم.
اوپشوب قوجوشارق ال اله ایچون ایچلوم،
مست لایعقل اولالم یقه‌لر چاک ایدلوم

*Keçdi bilməzlik ilə ömr, keçəndən keçəlüm,*
*Şimdidən gərü gəlin rəmzi-rümuzdan içəlüm.*
*Öpüşüb qucuşaraq əl ələ içün içəlüm,*
*Məsti-layəqəl olalım, yaxalar çak edəlim*

کله مز قزدی واروراق بزی می آله کبی،
یار دخی واروراق قصد قیله آله کبی.
سینه ده گللر آچوب بز ده او گوزی اله کبی،
مست لایعقل اولالم یقه‌لر چاک ایدلوم.

---

[1]. غزل- مربع دیواندا یوخدور. نظمی مجموعه سینده وار (۳۲۲٦)

*Kəlləmiz qızdı varuraq bizi mey ala kimi,*
*Yar daxı varuraq qəsd qıla ala kimi.*
*Sinədə güllər açıb, biz də o gözi ala kimi,*
*Məsti-layəqəl olalım, yaxalar çak edəlim.*

اولدوررسه بزه نه واعظ شمشیر خطیب،
باده صونسونک بزه تک یار علیرغم رقیب.
بنه اولورسه اوله نیجیه دک بویله شکیب،
مست لایعقل اولالم یقه‌لر چاک ایدلوم.

*Öldürürsə bizə nə vaizu şəmşiri xətib,*
*Badə sunsun, bizə tək yar, əlarəqmi-rəqib.*
*Netə olursa ola, necəyədək böylə şəkib.*
*Məsti-layəqəl olalım, yaxalar çak edəlim.*

نیجه بر جور ایله بلبل کبی گریان اولالم،
دم بو دمدر ایچلم گل کبی خندان اولالم.
حاتم جان ایله مجلسده سلیمان اولالم،
مست لایعقل اولالم یقه‌لر چاک ایدلوم.

*Necə bir cövr ilə bülbül kimi giryan olalım,*
*Dəm bu dəmdir, içəlim , gül kimi xəndan olalım.*
*Hatəmi-can ilə məclisdə Süleyman olalım.*
*Məsti-layəqəl olalım, yaxalar çak edəlim.*

ای **بصیری** دیروبن ادرینه نونک خوبلرنک،
تازه سوزلرله اقیدوب کندونه محبوبلرنک.
کوکلره اقدورلم ذوق و صفا طوبلرنک،
مست لایعقل اولالم یقه‌لر چاک ایدلوم.

*Ey Bəsiri, dirübən, Edirnənın, xublərin,*
*Tazə sözlərlə axudub kəndinə məhbublərin,*
*Göylərə  axduralım zövqu səfa tupların.*
*Məsti-layəqəl olalım, yaxalar çak edəlim*

## دؤردلوکلر

١

| | |
|---|---|
| *Ey mühiti ulum kəm məxzə,* | ای محیط علوم کم مخزه، |
| *Qətrədir elminiz qatında dəniz.* | قطره در علمونوز قتنده دنیز. |
| *Dediniz verəlim sənə sədəqə,* | دیدینیز ویرلوم سکا صدقه، |
| *Vədədən qeyri nəsnə vermədiniz* | وعده دن غیری نسنه ویرمه‌دنوز. |

٢

| | |
|---|---|
| *Zirəloğluna şairin birisi,* | زیرک اوغلنه شاعروک بریسی[١]، |
| *Mədh ilətdi çün dövlətə irdi.* | مدح ایلتدی چو دولته ایردی. |
| *Gər sorarsan nə verdi caizə[٢],* | گر سوراررسن نه ویردی جایزه سنکا، |
| *Lütflər etdi, vədələr verdi.* | لطفلر ایتدی وعده لر ویردی. |

٣

| | |
|---|---|
| *Kim ki, bimarxanəyə girdi,* | کم که بیمار خانه گیردی[٣]، |
| *Əcəli gəldi, qəbzi-ruh etdi.* | عجلی گلدی قبض روح اتدی. |
| *Çünki, içdi nəsufi şərbətini,* | چونکی ایچدی نصوحی شربتینی، |
| *Səhhətə tövbeyi-nəsuh etdi.* | صحته توبۀ نصوح اتدی. |

## مفردلر

شول ایکی مخمور کوزلر عارض دلدارده،

*Şol iki məxmur gözlər arizi-dildarda,*

ایکی نرکس در اچلمش کوشۀ کلزارده.[١]

---

[١]. تهران آلیازما سینده بو مربع یوخدور.

[٢]. Mükafat, əvəz

[٣]. تهران آلیازما سینده بو مربع یوخدور

*İki nərgisdir açılmış guşeyi-gülzarda.*

****

*Aşiqlərini ahu məsihadəm öldürü,* عاشقلرنی آه و مسیحادم اولدرر[2]،

*Bu adəm oldur ki,məsiha dəm oldurur.*.بو ادم اولدرر که مسیح ادم اولدرر

****

*Zehi mrasim cudun mürəbbəi-fuzəla,*زهی مراسم جودنک مربعی فضلا،

*Ləvayehi himənin oldı feyzi-əhli-huzur.* لوایح هیمه نوک اولدی فیض اهل حضور.

*Küftə kirpiyin dəhanında,* کوفته کر بنکون دهاننده،

*Toplardır Boğaz hisarında.* طوبلاردر بوغاز حصارنده.

****

*Bizə limonla tutuna gərək,* بزه لیمونله تورونه کرک،

*Nə daşşağın durur ağac qavunı.* نه تاشاغون درر اغاج قاونی.

****

*Hicrdən gözlərim dənizin,* هجردن کوزلروم دنیزوک،

*Eynidir,leyk yaşı bənzəməz sənin.* عینی در لیک یاشی بکزمز سنک.

## مطلعلر

منصب حسنک دریغ ایلر بو بن افتاده دن،

دلبروم بی رحمرک اولمش مویدزاده دن.

*Mənsəbi-hüsnün dəriğ eylər bu bən uftadədən,*
*Dilbərin birəhmrək olmuş müəyidzadədən[3].*

****

*Dərzioğlu göndərir can parəsi,* درزی اوغلی کوک درر جان پاره سی،

*Dönə-dönə olmuşam avarəsi.* دونه دونه اولمیشام آواره سی.

****

---

[1]. BNF کیتابخاناسیندا اولان محموعه ترک ۲٤٥ ص. ۲۲۹

[2]. استانبول و تهران ألیازما لرینده یوخدور.

[3]. Bayəzid zamanında bir vəzifəli mənsəb sahibi adamdır.

سینمه بیر تیر اوردن ایلدنک زخمینک زیاد[۱]،
عاجز ایکن اول خدنک زخم ایله بن نامراد.

*Sinəmə bir tir vurdun eylədin zəxmin ziyad,*
*Aciz ikən ol xədəng zəxm eyləyibən namurad.*

****

روشن اولدی کون کبی ای مه سنوک کرامتونک،
سکا اق یلدز دیین بلمز سنوک ماهییتنک

*Rövşən oldı gün kibi ey məh sənin kəramətin,*
*Sana aq ukduz deyən bilməz sənin mahiyyətin.*

****

خنجروکه قرشو وارور بو دل بی باکیمز[۲]،
بیر یورک کوسترسنک اخر سینهٔ صد چاکیمز.

*Xəncərinə qarşı varır bu dili-bibakımız,*
*Bir ürək göstərsən axir sineyi-səd çakımız.*

****

صون لعلینک چون خط سیه فام یتشدی[۳]،
آچدر بنی غم روزه سنک احسان یتشدی

*Sun ləkin çün xətti-siyəhfam yetişdi,*
*Açdır bəni ğəm ruzəsinin ehsani yetişdi.*

---

[۱]. مطلع تهران و اسنبول ألیازما سینده یوخدور.
[۲]. مطلع تهران و اسنبول ألیازما سینده یوخدور
[۳]. مطلع تهران و اسنبول ألیازما سینده یوخدور

## *BƏNGNAMƏ*

### *Gufte Molana Bəsiri*

*Bir dadlı hikayət və bir şirəsi şirin rəvayət istədilər ki, mucibi-izdiyadi iştahya istişhad ola və bu fəqiri-həqir daxı anların diləgin qəbul edir.*

*Bu bəngiyi dərdimən və buryanın həsrətindən müstəmənd ki, bu bar ilə ölmüş və aclıq atəşinə yanmış ola, kəlaci-Əcəmdən ana kəfən edib, riştəyi qətaif iplik1ə dikübb, xəmavi nabatı kafuri eyləyib, şəkkər şərbəti ilə yuyub, xanəgi halva məqbərəsində kümüb və səbuni halvadan , iki həcə daşı tikib, üzərinə bu tarixi yazdıq. Daxı ol bəngi şirinkarın üzərinə bir qubə yaparız, pilovdan içini məhləbi birlə sıvarız və ol türbəyə zülabidən rəngin camlar edib və patlıcan doldurmasından qəndil edəriz və Misir qarpızından ki, ana bithuseyf dirlər bir küp su qoyarız və səhnin fərşinə şəkkəri dublə ilə duğla yerinə döşəriz və bumbardan iki kafuri mumbaşl və ayağı ucuna tikib, bi qəzəli yazarız. Beyt:*

*Qəlyə qoxusu nəsimi-rühpərvərdir bana,*
*Salmanın hər yarpağı bərgi-güli tərdir bana.*
*Küf keçirəm gər qorma gəlməzsə süfraya,*
*Yəxni gər irişməsə, ölmək müqərrərdir bana.*
*Sunduğumca şəkkəru paludaya hərdəm dirəm,*
*Məzmidirməz kim, sənün, vəslin müyəssərdir bana.*
*Deməgil bana Bəsiri, varmıdır iştihanın,*
*Çün gəkunun ayəti heyrədə əzbərdir bana*

## بنک نامه

### گفت مولا بصیری

بر طتلو حکایت و بر شیره سی شیرین روایت استدیلر که موجب ازدیاد اشتهای استشهاد اوله و بو فقیر حقیر دخی آنلرونک دیلگن قبول ایدب بر بنکی دردمند و بریانونک حسرتندن مستمند که بو بر ایله اولمش و آجلق آتشنه یانمش اوله. کلاج عجمدن اکا کفن ایدب رشتهٔ قطائف اپلکیله دیکوب حموی نبات کافوری ایلیوب شکر شربتیله یویب خانگی حلوا مقبره‌سنده کومپ و صبونی حلوادن ایکی هجه طاشی دیکوپ اوزرنه بو تاریخی یازدق. دخی اول بنکی شیرینکارنک اوزرینه بر قبه یپاروز پلودن ایچنی مهلبی برله صیوارز و اول توربیه زولابیدن رنگین جاملر ایدب و باتلیجان طولدرمسندن قندیل ایدروز و مصر قرپوزندن که اکا بتهو صیف درلر بر کوپ صو قورز و صحنه نک فرشنه سکری دوبله ایله توغله یرینه دوشروز و بومبردن ایکی کافوری موم باشی و اباغی اوجنه دیکوب بو غزلی کنارنده یازرز. بیت

قلیه قوقسو نسیم روح پروردر بکا،
صالمانونک هر یبراغی برگ گل تردر بکا.
کف کچرم گر قورمه گلمزیسه سفره یه،
یخنی گر ایرشمه سه اولمک مقرردر بکا.
صوندوغومجا شکر پالودیه هر دم دیرم،
مزمیدرمز کم سنون وصلوک میسردر بکا.
دیمه‌گل بکا بصیری وار میدرر اشتهانک،
چون کلنونک آیتی هر دمده ازبردر باکا

.

*Salmasın hər yarpağı sifr oldı, mahiçə əlif.*

*Yufqa ovraqi hesabu süfrə dəftədir bana.*

*və bir türbədar ki, ismi balı ola və övrətin adı halva xatun ola və başı bəybazarı qorundan və qulaqları börək tutmacından , gözləri badamdan ola və yaxud bişmiş yumurtadan kim, iki para etmiş olalar. Qaşı dadlı qavun dilimindən , xəyal eləni börəkdən, binəsi qorma badamı halvadan, saqalı pəşmanı halvasından və dişləri nabati- xamavi xablardan və ağzı şəkkəri-xəndan püstədən, dili badam yağından bişmiş, şəkkəri cüllabına bulaşmış dil pəndirdən, zənəxdanı Aqşəhərin bədmali akmasından, boynı qəsəb xurmasından, üzi bayram çörəyindən, yəni çörək otundan, boyni yənəxdən, qolları ləvrək balığından, dügünləri, pulları ola. Bir yanı buryandan və bir yanı kababdan, köksi tava buryanından, qarnı şirdəndən, bağırsağı mahiçədən, ayaqları paçadan və otraq yerin istisfar edərsiniz kümәc balından və zəkəri Ərəbistan mozundan və daşaqları Hindustan cəvizindən bir əsasi şəkkər qamışından , bir təsbihi şəkkəri noxuddan və bir təsbihi dadlı üzümdən və bir təsbihi də dizi anardan, dizi əncir təsbihində vətteyn oxur. Və üzümdən təsbihində bu Ayət oxunurƏ və ənəb və qəzəbə və daxı bu beyt tərrənüm edir:*

*Həqq budur kim, yemişlər içində,*

*yoxdur üzüm jibi şirəli məta.*

*və andan təsbihindən bu ayəti vəqunur vəfiha fəqihət bənəxluvə rumən.*

صالمننک هر یپرغی صفر اولدی ماهیچه الف،
یوفقه اوراق حساب و سفره دفتردر بکا

و بر توربه‌دار که اسمی بالی اوله و عورتنک آدی حلوا خاتونک اوله و باشی بیک بازاری قورونده و قولاغلری بورک تتماجندن گوزلری بادمدن اوله و یاخود بشمش یمرتادن کم ایکی پاره اتمیش اولالر قاشی طتلو قاوون دیلیمندن خیال النی بورکدن بینسی قارمه بادمی حلوادن صقلی پشیمانی حلواسندن و دیشلری نبات حموی خابلردن و آغزی شکری خندان پسته دک دلی بادم یاغیندن بشمش شکری جلابنه بولشمش دل پنیرندن زنخدانی آق‌شهرک بدغانی آلمه‌سندن بوینی قصب خرماسندن یوزی بیرام چوره کندن یعنی قره چورک اوتندن بوینی یخندن قوللری لورَک بالغیندن دوکونلری پوللری اوله. بیر یانی بریاندن و بیر یانی کبابدن کوکسی تبا بریاندن قارنی شیردندن باغرساقی ماهیچه دن ایاقلری پاچه دن و اوتراق یرین استفسار ادرسنز کومچ بالیندن و ذکری عربستان موزندن و طاشقلری هندستان چویزندن بر عصاسی شکر قمشندن بیر تسبیحی دیزی اینجردن و بیر تسبیحی شکری نخوددن و بر تسبیحی طتلو اوزومدن و بر تسبیحی ده دزی اناردن. دزی انجیر تسبیحنده والطین اوقر. و اوزومدن تسبیحنده بو آیت اوقنر. و عنب و قضب . و بو بیت دخی ترنم ایدر.

حق بودر کیم یمشلر ایچنده،
یقدر اوزوم کبی شیره لی متاع.

و اندن تسبیحندن بو ایتی اوقنور و فیه فقیه و نحل و رومن.

*Və bu qəzəl dilində tərənnüm edə*

*Bən bəlğur aşını sevməzəm, tanrım bana irgürməsin,*
*Danə birincik quluyam, şorbayi gözüm görməsin.*
*Bən qəlyənin dərvişiyəm, həmsalmanın üftadəsi,*
*Bumbar ikən saklnmasın, börək ikən üfürməsin.*
*Dən kim, kəsilsin danədən əvvəl riştəyə yoxsa dirəm,*
*Bir parə yer ikən, daxı ol arada oturmasın.*
*Paludayı məhrum sanıb, dedim ana əsrarımı,*
*Badama dililə demişsərəm getsin, durmasın.*
*Miskin Bəsirikönlüni mantuya məəva eylədi,*
*Yarəb kələm şorbası görstərmə gözüm görməsin.*

*Və o türbəyi-mükərrəmənın vəqfi balıbdır və bal iksiri və mütəvəllisi bəngi batman və naziri əsəli-binəva və cabisi mola kəndi. əgər sual edirsələr  əsəli-binəva kordur, nədən nazir olub, cavab ki, ölən daxı kor bəngidir.*

و بو غزل دیلنده ترنم ایدر:

بن بلغور آشنی سومزسم تانریم بکا ایرگورمسونک،
دانه برنجیک قولیام شوربایی گوزم گورمه سونک.
بن قلیه نونک درویشیم هم صالمانک افتاده سی،
بومبر ایکن صالنماسنک بورک ایکن اوفرمه سونک.
دن کم کسیلسوک دانه دن اول رشتیه یوخسه درم،
بر پاره یر ایکن دخی اول اراده اوتورمه سونک.
پالودیه محروم صانوب دیدم اکا اسرارمی،
بادامه دلیله دیمش سرم گتسونک طورماسونک.
مسکین بصیری کوکلونی مانتویه ماوا ایلدی،
یا رب کلم شورباسنی کوسترمه کوزم کورمه سونک.

و اول توربه مکرمه‌نک وقف بالیبدره و بال اکسیری و متولسی بنگی باتمن و ناظری عسل بی نوا و جابیسی منلا کندی. اگر سوال ایدرسه لر عسل بینوا کوردر ندن ناظر اولور جواب که اولن دخی کور بنگی در.

21-Dəmirçizadə Ə. Azərbaycan ədəbi dilinin tarixi. I hissə. Bakı: “Maarif”, 1979.
22-Mirzəzadə H. Azərbaycan dilinin tarixi qrammatikası. Bakı: Azərbaycan Universiteti Nəşriyyatı, 1990.
23-Пригарина Н.И.Образное содержатие бейта в поэзии на персидском языке/Восточная поэтика. Специфика художественного образа. Москва: «Наука», 1983.

8-Musabəyli Azadə. Türkiyədə yaranan Azərbaycan ədəbiyyatı və Xəlilinin "Firqətnamə"si. Bakı. "Nurlan", 2010.
9-İçli Ahmet. Basiri`nin yeni türkçe şiirleri. Karadeniz, 2014, №31.
10-Başpınar Fatih. Basiri`nin Benginame adlı eseri. Turkish Studies İnternational Periodical for the languages literature and history of Turkish of Turkic Volume 6/3 Summer 2011, p.567-576
11-Çavuşoğlu Mehmet. Basiri. DİA.C.5. İstanbul, 1992.
12-Щерба А.М. Грамматика староузбекского языка, Москва-Ленинград: Издательство Академии Наук СССР, 1962.
13-Navoiy Alişer. Xazoyinul-maoniy.III. Badoyiul-vasat. Toşkent: Uzbekistan SSR Fanlar Akademiyası Naşrieti, 1960.
14-Nəsimi İmadəddin. Seçilmiş əsərləri. Bakı: Azərnəşr, 1973.
14-Quluzadə Mirzağa. Füzulinin lirikası. Bakı: Azərbaycan SSR Elmlər Akademiyası Nəşriyyatı, 1965.
15-Füzuli Məhəmməd. Əsərləri. Altı cilddə. II cild. Bakı: "Şərq-Qərb", 2005.
16-Füzuli Məhəmməd. Əsərləri. Altı cilddə. I cild. Bakı: "Şərq-Qərb", 2005.
17-Mir Cəlal. Füzuli sənətkarlığı. Bakı: "Nurlan", 2007.
18-Sehi bey. Tezkire "Heşt-behişt". İstanbul: Tercuman qazetesi, 1980.
19-İsen Mustafa. Künhü`l-ahbar`ın tezkire kısmı. Ankara: Atatürk Kültür, Dil ve Tarih Yüksek Kurumu. Atatürk Kültür Merkezi Yayını-sayı 93, Tezkireler dizisi-Sayı:2.
20-Köprülüzadə Məhəmməd Fuad. Azəri ədəbiyyatına aid tədqiqlər. Bakı: "Sabah", 1996.

Şairin müxtəlif tarixi hadisələrə həsr edilmiş maddeyi-tarixləri də Osmanlı müəllifləri tərəfindən yüksək qiymətləndirilmişdir.

Şeirlərini araşdırdıqda görürük ki, Bəsiri Kişvəri, Həbibi, Süruri, Xətai, Hamidi və başqaları kimi Nəsimidən sonrakı, Füzulidən öncəki dövr ədəbiyyatımızın, XV-XVI əsrlər poeziyamızın görkəmli nümayəndələrindən biri olmuşdur. Onun əldə olan şeirlərinin toplanaraq bir kitab halında nəşri və ətraflı tədqiqi dövrün ədəbiyyatının öyrənilməsi, şairin ədəbiyyat tariximizdəki mövqeyinin müəyyənləşdirilməsi baxımından böyük maraq kəsb edəcəkdir.

**İstifadə edilmiş ədəbiyyat**

1-Əfşar Sadiq bəy. Məcməül-xəvas/ Nəşrə hazırlayan: Əkrəm Bağırov. Bakı: “Elm”, 2008.

2-Karahan Abdülkadir. Eski Türk Edebiyatı İncelemeleri. İstanbul: Edebiyat Fakültesi Yayınları, 1980.

**3-**Latifi tezkiresi / Hazırlayan: Mustafa İsen.Ankara: Kültür Bakanlığı Yayınları, 1990.

**4-**Aşık Çelebi**.**Meşa`irü-ş-suara [ İnceleme-Tenkitli Metin]. 2 cilt/ Hzr: Filiz Kılıç. Gazi Üniversitesi, Sosyal Bilimler Enstitüsü, Eski Türk Edebiyatı Anabilim Dalı, Ankara [Basılmamış doktora tezi].

**5-**Kartal Ahmet**.** Basiri ve türkçe şiirleri. 2014, Dergipark.org, tr.

6-Kınalı-zade Hasan Çelebi. Tezkiretu`ş-suara I cilt./ Hazırlayan: İbrahim Kutluk. Ankara: Türk Tarih Kurumu, 2014.

7-Hikmət İsmayıl. Azərbaycan ədəbiyyatı tarixi. 2 cilddə. I cild. Bakı: Azərnəşr, 1928.

Lətfü nəşr poetik fiqurundan məharətlə istifadəyə nümunə:
Məni gördükcə xəlq onunla derlər,
Ənis olmuş, görün, Məcnuna ahu.

Birinci misradakı mən (aşiq) və o (məşuqə) sözləri ikinci misradakı Məcnun və ahu (ceyran) sözləri ilə əlaqələndirilmişdir ki, bu da ləffü nəşrin əlamətidir.

Rəddüs-sədr aləl-əcuz poetik fiqurundan (beytin birinci sözünün sonda eyni mənada işlədilməsi) istifadəyə örnək:
**İntizarı** öldürür hər dəmdə min kərrə məni
Həq demişlər kim, ölümdən betərdir **intizar**.

Bəsiri şeirindəki mübaliğələr yüksək poetikliyi ilə diqqəti cəlb edir. Füzulinin bir sıra mübaliğələri ilə onunkular arasında müqayisə aparmaq olar.
Ey Bəsiri, sərbəsər xakistər olar kainat,
Düşsə aləm içrə ahim atəşindən bir ləhib.

Tənuri-atəşi-qəm oldu sineyi-suzan,
Onun içindəki od şöləsi zəbanımdır.

Ahım şərarəsi necə yaxmaya aləmi,
Bir oddur ol ki, duzəx onun bir şərarıdır.

Atəşi-dil eylədi kül aləmi sərtasər,
Nuh tufanın qopardı dideyi-nəmnakımız.

Ey Bəsiri, olmadı ahım müəssir, gərçi kim,
Daşa təşir eylədi ah ilə əfğanın sənin.

Bir yandan aşiqin dostu-məşuqəsi, digər tərəfdən düşməni-rəqib ona əziyyət verirlər. İki zərbə alan aşiqin vəziyyətini Bəsiri belə təsvir edir:

Bir yana tə`ni-rəqibü bir yana cövrün sənün
Dad əlindən dustun, fəryad əlindən düşmənin.

Burada "dust" və "düşmən" sözləri ilə təzad bədii ifadə vasitəsi yaradılmışdır. Bəsirinin şeirlərində hüsn-mətlə, təzad, təkrir, cinas, təşbih, ləffü nəşr, rəddüs-sədr aləl-əcuz, mübaliğə, touzi, hüsni-təlil bədii ifadə vasitələrindən məharətlə istifadə edilmişdir. Aşağıdakı beytdə təkrir, cinas və hüsni-təlil poetik fiqurlarından istifadəni görürük:

Səba bu rəşkdən kim, öpdüm izin,
Özün yerdən-yerə vursa, yeri var.

Şair gözəlin izini öpdüyünə görə səba yeli qısqanclığından özünü yerdən-yerə vurur, yəni bərk əsməkdədir. "Səbəb və bəhanə gətirməyin gözəlliyi" demək olan hüsni-təlildən istifadə zamanı bir əlamət və ya hərəkət, keyfiyyət (burada aşiqin gözəlin ayaq izlərini öpməsi) başqa əlamət və hərəkətə (burada səbanın qısqanclıqdan bərkdən əsməsinə) səbəb olur, nəticədə ikiqat təsvir özünü göstərir. Beytdə "yer" sözünün iki dəfə işlədilməsi təkrir sənətinin əlamətidir. "Yeri var" ifadəsində "yer" sözü başqa mənada (yəni, başa düşüləndir) işlədilmişdir. Beyt daxilində eyni cür səslənən, yazılan fərqli mənalı sözlərin işlədilməsi cinas sənətinin əlamətidir. Təşbih poetik fiqurundan istifadəyə örnək:

Yaşım hicrində cuyi-abə bənzər,
Gözüm ol abdə girdabə bənzər.

Aşiqin göz yaşı axar suya, çaya, gözü isə bu çaydakı girdaba, burulğana bənzədilmişdir.

hökmdarlara qədər şeir yazırdılar) tərəfindən yüksək dəyərləndirilməsinin əsas səbəbi idi. Şərq poetikasında bitkin bir fikri ifadə edən beyt Avropa poeziyasındakı şeirə bərabər hesab edlir (24, s.89). Bəsirinin beytlərini şeirlərindən çıxararaq təqdim etdikdə özünün poetik, fəlsəfi, etik, ibrətamiz-nəsihətamiz mənası olan bir şeirə (təkbeytə) çevrilir. Şairin qəzəllərinin birinci beytləri-mətlələri xüsusilə diqqətəlayiqdir. Şərq poetikasında hüsni-mətlə və ya hüsni-ibtida ilk beytin forma və məzmunca diqqəti cəlb edən, digər beytlərdən seçilən, fərqli olması tələbinə cavab verən poetik fiqurdur. Şairin qəzəllərindən bir neçə mətləni örnək gətirək:

Kirpigin sehr oxudur, əbrulərindir yay ana,
Bir bənim kibi bəlakeş uğrar isə, vay ana.

Şol nazənin ki, dili-zarım aşinadır ana,
Bəlayi gör ki, gözəllər də mübtəladır ana.

Arifə dövlətdən istiğna kibi dövlətmi var,
Tərki-ləzzəti-cahan etmək qədər ləzzətmi var.

Tiri-cəfa ilə ürəyim parə eylədin,
Bir yarə bitmədən dəxi bir yarə eylədin.

Xəlqi-cahan sözi bu kim, qəm adəm öldürür,
Canım bədəndə olmayacaq, qəm nəm öldürür.

Bəsiri beytlərində həyati bir obraz yaratmağı, psxoloji durumu təsvir etməyi bacaran sənətkardır. O, şeirində lirik qəhrəman-aşiqin eşqində qeyri-müəyyən vəziyyətini belə şərh edir:

Sənin dərdindən, ey şuxi-cəfakar,
Bəla bu kim, nə sağam mən, nə bimar.

Bu şeirlər şairin yumoristik mövzuda yazdığı “Bənginamə” əsərinə də daxil edilmişdir.

Bəsirinin nüktədanlığı satirik şeirlərində, həcvlərində də, lirik qəzəllərində də özünü göstərməkdədir. Qaziəskər vəzifəsinə təyin edilmiş Zeyrekoğluna şair bir mədhiyyə qəsidəsi yazır. Zeyrekoğlu əvəzində caizə verəcəyini vəd etsə də vədini “unudur”. Bəsiri bu “unutqanlığa” iki kiçik qitə həsr etmişdir. Onlardan biri belədir:

Zeyrekoğluna şairin birisi,
Mədh ilətdi, çün dövlətdə idi.
Gər sorarsan nə verdi caizəsin?
Lütflər etdi, vədələr verdi.

Burada şair Zeyrekoğlunu heç bir sözlə pisləmir, lakin sonda müəllif kinayə tərzi ilə “vədədən başqa heç nə verməyən” dövlət məmurunun xəsisliyini ifşa etmiş olur. Bəsirinin bu və başqa həcv xarakterli, eləcə də yumoristik şeirlərini örnək gətirən osmanlı təzkirəçiləri şairin nüktədanlığından danışarkən onun incə eyhamlı, kinayəli fərdi yaradıcılıq üslubunu nəzərdə tuturlar.

XV-XVI əsrlər poeziyasının janrlar iyerarxiyasında qəzəlin mövqeyi daha da möhkəmlənir. Qəzəlin mövqeyinin möhkəmlənməsində Füzuli və onun ədəbi məktəbinin nümayəndələri mühüm rol oynasalar da, bu nəzm şəklinin inkişafında daha öncəki sənətkarların, o cümlədən, Bəsirinin də müəyyən xidmətləri olmuşdur. Qəzəl dilinin sadəliyinə, səlisliyinə, türk mənşəli sözlərin işlədilməsinə xüsusi fikir verən Bəsiri, lakonikliyə, fikri qısa və aydın ifadə etməyə çalışırdı. Onun qəzəllərinin çoxu beş beytdən ibarətdir. Fikrimizcə, nüktədanlığı, incə yumoru, sərrast satirik qələmi, eləcə də lakonikliyi onun əsərlərinin Osmanlı təzkirəçiləri, şairləri və şeir həvəskarları (o zaman məmurlardan tutmuş

dibaçəsində şeirinin elm və maarifdən xali olmamasına çalışdığını deyir.

Bəsiri qəlb şairidir, insanın hiss və həyəcanlarını, sevinc və kədərini, həyatdan feyz almasını, tənhalığını ifadə etmək ustasıdır. Şeirlərindən birində, o, elan edir ki, eşq həyəcanlarımı bölüşəcəyim bir həmsöhbətim, həmdərdim vardır, o da könlümdür:

Şərhi-dərdi-eşqi axır kimə təqrir eyləyim,
Bir könül adlı müsahib, dərdməndim var ikən.

Dövrünün bir sıra digər şairlərindən şuxluğu, nikbinliyi ilə seçilən Bəsiri bəzi şeirlərində ələmlə, qəmlə dostluq etdiyini, həyat yolunda onları səfər yoldaşı seçdiyini bildirir:

Fəğan ənisi-şəbü ruzü nalə həmnəfəsim,
Ələm müsahibü qəm yari-mehribanımdır...

Ədəm yolunda yoldaşım qəmindir,
Səfər müşküldürür olmasa yoldaş.

Bununla bərabər, şairin nikbinliyi, həyata yumorla yanaşması əsərlərindən görünməkdədir. Onun türkcə şeirlər toplusuna daxil edilmiş, sevdiyi və xoşuna gəlməyən xörəklərdən danışdığı iki qəzəli yumoru, həyatdan ləzzət almaq həvəsi ilə diqqəti cəlb edir:

Bulqur aşını sevməzəm, Tanrım ana irgürməsin,
Danə birincün quluyam, şorbayı gözüm görməsin
Mən qəlyənin dərvişiyəm, həm salmanın üftadəsi,
Bumbar inən salınmasın, börək inən üfürməsin...
Miskin Bəsiri könlüni mantuya məva eylədi,
Ya Rəbb, kələm şorbasını göstərmə, konu görməsin.

aid edilməsi istiarə poetik fiqurunun səciyyəvi cəhətidir). Şair burada heç bir sənətkarın şeirlər toplusu-divanından nəyisə götürmədiyini, iqtibas etmədiyini bildirir. Bəllidir ki, şairlərin özlərini öyən, fəxriyyə xarakterli şeir və beytləri az olmayıb (bu məsələdə Füzuli də istisna deyil). Bəsirinin bu ənənəyə uyğun olaraq yazdığı beytlərdə onun sənətə, sənətkara baxışlarının da ifadəsini görürük. Şair şeiri qızıla, özünü isə qızılı qiymətləndirən sahibəyara bənzədərək deyir ki, qızılım, var-dövlətim olmasa da, qiymətdə qızıla bərabər olan şeiri düzgün dəyənləndirməyi bacarıram:

Zər nəqdi gərçi yoxdur əlində Bəsirinin,
Əşar təqdirinin hələ sahibəyarıdır.

Şair bildirir ki, hər kəs onun şeirini anlaya, əsl qiymətini verə bilməz, onun həqiqi sənətini bundan agah olanlar qiymətləndirə bilər:

Ey Bəsiri, nə bilir sözüni hər qafil kim,
Əhli-təhqiq sözün mərdümi-agah bilir.

Fəxriyyə xarakterli bir qəzəlində şair bəlağət mülkünün sərvərlərindən, müasir sənətkarlardan üstün olduğunu, elm, maarif dənizinin dərinliklərinə baş vurduğunu elan etməkdədir:

Bənəm ol mərdi-xəşm bu tiği-tizi nəzmimlə,
Bəlağət mülkünün sərvərlərin cümlə zəbun etdim .
Bənəm ol aşinayi-lücceyi-bəhri-maarif kim,
Neçə qəvvasi-bəhri-nəzmi anda sərnigun etdim.

Bəsiri ustad sənətkar olmaq üçün elmin, maarifin dərinliklərinə baş vurmaqdan danışır: Bir müddət sonra ədəbiyyata gələn Füzuli də bu fikri təsdiqləyir, türk divanının

Bəsirinin qəzəllərində ifadə etdiyi arzu və diləkləri həyatidir, istəkləri hər kəsin qəlbinə yaxındır. Şeirlərindən birində şair xoş, mülayim xasiyyətli bir yarın, həmdəmin olmasını yalnız onun özü üçün deyil, hər kəs üçün ən böyük arzu, ən böyük var-dövlət olduğunu bildirir:

İnsana cahan içrə budur dövləti-üzma,
Bir yari-mülayimlə müqarin ola daim.

Bununla yanaşı şairin yaradıcılığında təsəvvüfün, irfanın da müəyyən dərəcədə yer tutduğunu, onun vəhdəti-vücud təlimini qəbul etdiyini görürük:

Daxi təsdi etməz oldı kəsrəti-rənci-xumar,
Ey könül, meyxaneyi-vəhdət olalı məskənin.

Bəsirinin əvvəldən sona qədər irfana həsr edilmiş şeiri vardır:

Yardan özgə bu könül xanəsində kimsə yox,
Şükr kim əğyardan xali olubdur xəlvətim.
Xəlvəti-üns içrə tənha sanma, ey zahid, məni,
Qüdsivü ruhanilərdir hər gecə həmsöhbətim.
Mən fəna meyxanəsinin rindiyəm, ey müğbəcə,
Olicək xişti-səri-xüm ilə lövhi-türbətim...

Bəsiri yaradıcılığında özündən əvvəl yaşamış və ya çağdaşı olan sənətkarların yolu ilə getməmiş, yalnız özünün yeni, orijinal fikirlərini ifadə etməyə çalışmışdır. Qəzəllərindən birində, o, deyir:

Məniyi-xasdır, Bəsiri, sözün,
Hiç divandan istiarən yox.

Burada "istiarə" sözünün hərfi mənası – götürmə nəzərdə tutulur. (Bir əşya və ya canlının xüsusiyyətlərinin başqasına

“Görünür” rədifli qəzəlində münəccimə müraciət edir və tale evində (talelərin yazıldığı yerdə-fələkdə) bu eşqin sonunun qan göründüyü cavabını alır:

Sordum əhvalımı eşqində münəccimlərdən,
Baxdılar tale evinə, dedilər qan görünür (17, s.133).

Şairin qəzəllərini oxuduqca belə qənaətə gəlirik ki, sadə, danışıq dilinə yaxın bir dildə yazmaq onun fərdi yaradıcılıq üslubunun səciyyəvi xüsusiyyətlərindəndir. Onun şeirlərində dilin sadəliyi ilə yanaşı qələmə alınan mətləblərin gündəlik həyatla bağlılığı diqqəti çəkən məqamlardandır:

Həmdəm kiminlə olurdum, gər ney olmasa,
Könlüm nə ilə əylənilirdi, mey olmasa.
Hicr olmasa vusal da olmazdı qaliba,
Olurmidi bahar cahanda dey olmasa.

“Nə qəzəl kim denilür ol üzü gözü qaş üçün” deyən şair aydın surətdə bildirir ki, şeirlərini həyatda olan real bir məşuqəyə həsr etmişdir. Şeirlərindən birində Bəsiri eşqində çəkdiyi cəfaları, əzabları sadalayır və bunları taleyin mərhəməti kimi qəbul edir:

Gəh cövrü gəh cəfavü dəmi zülmü gəh sitəm,
Çoxdur kərəmlərin, mən anın qansını deyəm.

Sevgisi yolunda çəkdiyi cəfalara həyati bir norma kimi adət etmiş şair onu eşq dərdindən müalicə etmək istəyən təbibə “başımızı ağrıtma” deyir:

Biz anun dərdinə adət etmişüz,
Başımız ağrıtma, billah, ey təbib.

ünsiyyətli xasiyyəti və istedadı hesabına XV-XVI əsrlər Osmanlı cəmiyyətində tanınması, buranın ədəbi-mədəni həyatında oynadığı rol gözlərimiz önündə canlanır. İ.Hikmət Bəsirinin şeirlərinin dilinin sadəliyi barədə yazır: “Dili zamanındakı bir çox şairlərdən hətta özündən sonra gələn şairlərdən çoxunun dilindən sadə olub asanlıqla anlaşılır” (7, s.273). Şairin əsərlərini oxuduqca bu sözləri təsdiqləməli oluruq. Onun “Əfəndim” rədifli qəzəlində aşiqin ürəkdən gələn bir səmimiyyətlə, sadə, anlaşıqlı, müasir oxucuların da asanlıqla anlayacağı bir dillə sevgilisindən şikayəti səslənməkdədir:

Bizimlə işin cəfa, əfəndi.
Adəmmi dözər buna, əfəndi.
Səndən necəsi vəfa uma dil,
Çün ömürdə yox vəfa,əfəndi.

Bəsirinin şeirlərində işlətdiyi ərəb-fars söz və ifadələrinin çoxu bu gün də dilimizdə işlənir:

Qəmi-hicrində işim naləvü ah,
Nedəyim, kimsə yox halımdan agah.
Mənə der eşqdən qıl tövbə zahid,
Necə tövbə, der: əstağfirullah.
Münəccim xal ilə zülfün görən, der:
Doludur fitnəsilə, ah, bu mah.

Burada sırf danışıq dilinin sadəliyi diqqəticəlb edir. Sonda münəccimə müraciət edən lirik qəhrəman belə bir cavab alır: bu xal ilə zülfün sahibi olan mah (gözəl –mah-ay ilə səma cismi mah-ay eyniləşdirilir) fitnə ilə doludur, yəni bu eşqin sonu təhlükəlidir. Bəsirinin bir müddət sonra Füzuli də

texnikasına məharətlə yiyələndiyi görünməkdədir. Məlum olduğu kimi, yarandığı dövrdən qəzəl nəzm şəklinin əsas mövzusu məhəbbətin tərənnümü olmuşdur. Zaman ötdükcə təsəvvüfi, irfani eşq Yaxın və Orta Şərq xalqları poeziyasında özünə möhkəm yer tutmağa başlayır. Bəsirinin şeirlərində real hisslər, yaşantılar, duyğular orijinal bədii təsvir vasitələri ilə ifadəsini tapır. İsmayıl Hikmət "Azərbaycan ədəbiyyatı tarixi" kitabında şairin yaradıcılığı barədə yazır: "Bu qədər var ki, daha çox həyati gedişlə getmiş və özünü mümkün olduğu qədər təsəvvüf pəncəsindən qorumuşdur. Onda Dördüncü Muradın həzl və həcvə meyyal və məddah ruhunu görürüz. Bir fərqi var isə, o da Bəsirinin daha şux, daha səyyal, daha məzacgir, və uysal olmasıdır. Nəf`inin ovqatı, qüruru onda yoxdur" (7, s.273). İ.Hikmət burada Bəsiri yaradıcılığının səciyyəvi cəhətləri barədə əsasən düzgün fikirlər söyləsə də onun bütün dedikləri ilə razılaşa bilmirik. Doğrudan da, şairin əsərlərində daha çox dünyəvilik üstündür. Onun şeirlərindəki şuxluğu, nikbinliyi də aydın şəkildə görürük. O, doğrudan da həzl və həcvə, satira və yumora meyl edən və uysal-vəziyyətə uyğunlaşmağı bacaran şair olmuşdur. Məddahlığına gəlincə, ədalət xatirinə demək lazımdır ki, dövrün əksər sənətkarları, o cümlədən, Füzuli də, Nəf`inin özü də bundan kənarda qala bilməmişdir. Məlum məsələdir ki, şairlər həyatlarını, heç olmasa, minimum dərəcədə təmin etmək üçün hökmdarlara, yüksək vəzifəli şəxslərə mədhiyyə yazmağa məcbur idilər. Buna görə onlara qürursuz demək olmaz. Vəziyyətə uyğunlaşmağa gəlincə, bəlli olduğu kimi, Bəsiri mühacir idi, İstanbula Azərbaycandan, Təbrizdən gəlmişdi, burada onun heç kimi yox idi. O, özünü və ailəsini təmin etmək üçün imkanlı şəxslərlə tanış olmağa, onların məclislərində iştirak etməyə, köməklərindən bəhrələnməyə məcbur olmuşdur. Bəsirinin

sözlərindən çox istifadə edib. “Yoldaş” sözü daha çox işlədilib. Bəsirinin elə qəzəli var ki, bu sözdən orada üç dəfə istifadə edilib. “Qan yalaşma qardaş” ifadəsi diqqəti cəlb edir. (Tehran Milli Kitabxanası nüsxəsində bu ifadə “qan yaşına yoldaş” kimi gedib). Fikirimizcə, bu ifadə iki nəfərin bir-birinin qanını dilinə vurmaqla qardaşlaşmasından ibarət qədim ayinlə bağlıdır. Həmin ayin sonralar yaddan çıxsa da ifadə daşlaşaraq XV-XVI əsrlər yazılı abidəsinə düşmüşdür. Qəzəllərdə rast gəıldiyimiz “addaş”(sonralar “adaş” şəklinə düşmüşdür) və “boydaş” sözləri Bəsirinin dilində -daş şəkilçisi ilə söz yaradıcılığı prosesinin davam etdiyindən xəbər verir:

Daşlarla döyündüyün Bəsiri,
Fərhad görürsə, deyə **addaş...**

Sərvqədlər gərçi çoxdur,vəli,
Sana **boydaş** olmaz bir sərvqənd.

Sonuncu örnəkdə Rəddüs-sədr aləl-əcuz poetik fiqurundan istifadəni görürük. Beytin birinci sözü sonda təkrar edilmişdir.

Bəsirinin əlimizdə olan əsərləri onu Füzuliyə qədərki poeziyamızda Kişvəri, Həbibi, Sürüri, Xətai ilə bərabər qəzəl janrını inkişaf etdirmiş sənətkarlardan saymağa imkan verir. Qəsidələri və nəsr əsərləri də olan şair sözün həqiqi mənasında qəzəl ustasıdır. Bəsirinin anadilli qəzəlləri dünyəviliyi, nikbin ovqatı, dilinin sadəliyi, səlisliyi, ahəngdarlığı ilə diqqəti cəlb edir. Herat ədəbi məktəbinin görkəmli nümayəndələri-Əbrürrəhman Cami, Əlişir Nəvai, Hüseyn Bayqara, Binayi, bir sıra Azərbaycan və Osmanlı şairləri ilə ünsiyyətdə olmuş, onların köməyi ilə poeziya sənətinin sirlərindən agah olmuş şairin hər əsərində onun şeir

sözlərindən çox istifadə edib. "Yoldaş" sözü daha çox işlədilib. Bəsirinin elə qəzəli var ki, bu sözdən orada üç dəfə istifadə edilib. "Qan yalaşma qardaş" ifadəsi diqqəti cəlb edir. (Tehran Milli Kitabxanası nüsxəsində bu ifadə "qan yaşına yoldaş" kimi gedib). Fikirimizcə, bu ifadə iki nəfərin bir-birinin qanını dilinə vurmaqla qardaşlaşmasından ibarət qədim ayinlə bağlıdır. Həmin ayin sonralar yaddan çıxsa da ifadə daşlaşaraq XV-XVI əsrlər yazılı abidəsinə düşmüşdür. Qəzəllərdə rast gəıldiyimiz "addaş"(sonralar "adaş" şəklinə düşmüşdür) və "boydaş" sözləri Bəsirinin dilində -daş şəkilçisi ilə söz yaradıcılığı prosesinin davam etdiyindən xəbər verir:

Daşlarla döyündüyün Bəsiri,
Fərhad görürsə, deyə **addaş...**

Sərvqədlər gərçi çoxdur,vəli,
Sana **boydaş** olmaz bir sərvqənd.

Sonuncu örnəkdə Rəddüs-sədr aləl-əcuz poetik fiqurundan istifadəni görürük. Beytin birinci sözü sonda təkrar edilmişdir.

Bəsirinin əlimizdə olan əsərləri onu Füzuliyə qədərki poeziyamızda Kişvəri, Həbibi, Sühruri, Xətai ilə bərabər qəzəl janrını inkişaf etdirmiş sənətkarlardan saymağa imkan verir. Qəsidələri və nəsr əsərləri də olan şair sözün həqiqi mənasında qəzəl ustasıdır. Bəsirinin anadilli qəzəlləri dünyəviliyi, nikbin ovqatı, dilinin sadəliyi, səlisliyi, ahəngdarlığı ilə diqqəti cəlb edir. Herat ədəbi məktəbinin görkəmli nümayəndələri-Əbrürrəhman Cami, Əlişir Nəvai, Hüseyn Bayqara, Binayi, bir sıra Azərbaycan və Osmanlı şairləri ilə ünsiyyətdə olmuş, onların köməyi ilə poeziya sənətinin sirlərindən agah olmuş şairin hər əsərində onun şeir

anladığı, dildə vətəndaşlıq hüququ qazanmış sözlərin kifayət qədər çoxluğu da inkaredilməz faktdır. Dövrün türkdilli poeziyasının təkraredilməz simasını müəyyən edən türk mənşəli söz və ifadələr kifayət qədər geniş istifadə edilirdi. Bəsirinin əlimizə çatmış qəzəllərində türk mənşəli rədif sözləri əksəriyyəti təşkil edir. Bunlar aşağıdakılardır: ana, mənə, sənə, tut, görgəc, yox, yetər, bilir, öldürür, gör, durur, bənzər, var, vardır, etməz, gərək, derəm, etdim, eylədin, sənin, ikən, qılan, mən, eyləyən, üçün, bizə, ilə, olmadı, çələbi, sözünü, oldı, düşdi, sıxıldı. Şair anadilli şeirlərində “Doğruya zaval yoxdur” atalar sözündən, əldən qoymamaq, bağrı dəlinmək, yaxıb yandırmaq, Nuh tufanı qoparmaq, göz ucu ilə nəzər etmək, səbri dağıtmaq, könlü açıq tutmaq, özünü yerdən-yerə vurmaq, qan ağlamaq, üzünə qarşı əhvalını söyləmək, soyuq dəmir döymək (əziyyətli iş görmək mənasında), yegrəgin Allah bilir (yaxşısını Allah bilir), basıcı hərami (yol kəsən, quldur) və.s. kimi danışıq dilindən gələn ifadələrdən geniş istifadə etmişdir. Sonrakı dövrlər yazılı abidələrimizdə işlənməyən, lakin XV-XVI əsrlərdə yazılmış əsərlərdə təsadüf edilən, təqlid etmək, özünü oxşatmaq mənasını verən “öykünmək” feli Bəsirinin şeirlər toplusunda dəfələrlə işlədilmişdir. “Mah öykünməz camalın şəm`inə yüz vəchlə” misrasında müəllif məşuqəsinə deyir ki, ayın özünü üzünün şamına, yəni sənin gözəlliyinə bənzətməsi mümkün deyil.Bəsirinin bəzi şeirlərində “Kibi” qoşması ilkin variantda, “biki” kimi işlədillir. Bəsirinin dilində müştərəklik, ortaqlıq, yoldaşlıq bildirən -daş şəkilçisinin köməyi ilə yaranmış düzəltmə isimlər maraq doğrurur. Tədqiqatçılar haqlı olaraq göstərirlər ki, -daş şəkilçisi sırf türk mənşəlidir, -da+eş hissələrindən ibarət olmuşdur. –da ismin yerlik halını bildirir, -eş isə yoldaş, ortaq deməkdir (23, s.58-59). Şairin anadilli şeirlər toplusunda “yoldaş”, “qardaş”, “sirdaş”

yazmamış olsun. Bəlkə də o zaman qəzəl yazmayanı şair hesab etməmişlər. Demək olar ki, Füzulinin uşaqlıq və yeniyetməlik dövrü məhz qəzəlin çox yayılma və sürətlə inkişaf etmə dövrü olmuşdur və Füzuli də ən mahir qəzəl şairi olmağın əhəmiyyətini, zəruriliyini, görünür, mühitin, zamanın meyllərindən dərk etmişdir... Ümumiyyətlə, bu üslubun yeni, yüksək zirvəyə qaldırılması Füzuli yaradıcılığı ilə üzvi surətdə bağlıdır. Lakin bu mərhələnin Füzuliyə qədərki müddətdə qəzəl üslubunda irəliləmə pillələcikləri mahiyyəti daşıyan dəyişikliklər və inkişaf istiqamətli bəzi əlamətdar cəhətlər də olmuşdur" (22, s. 171). Tədqiqatçı qəzəl üslubunun Füzuliyə qədərki mərhələsinin əsas əlamətlərini dilin sadələşmə və səlisləşməsində, türk mənşəli nitq hissələrindən istifadənin sayının artmasında, şeirlərdə daha çox dildə vətəndaşlıq hüququ qazanan, anlaşılan ərəb-fars söz və ifadələrinin işlədilməsində, Nəsimi və Qazi Bürhanəddində olduğu kimi, ya sırf türk mənşəli, ya da ərəb və fars sözlərindən formalaşmış analitik fellərdən qafiyə yaradılmasında, müəyyən qədər cığatay sözlərinin işlədilməsində görür. Məhəmməd Bəsiri Kişvəri, Həbibi, Sürurі, Hamidi, Xətai, Xəlili və başqaları ilə bərabər Füzuliyə qədərki XV-XVI əsrlər Azərbaycan, eləcə də Osmanlı şeir dilinin xəlqiləşməsində mühüm rol oynamışdır. Şairlər və tədqiqatçılar türk dilləri arasında meydana çıxan fərqləri göstərsələr də, alimlər bunu da göstərirlər ki, XVI-XVII əsrlərə qədər türk (oğuz) dilləri arasında ümumiliklər çox olmuşdur. Bu səbəbdən ömrünün əsas hissəsini İstanbulda yaşamış Bəsirinin Azərbaycan və Osmanlı ədəbi dillərini imkan daxilində inkişaf etdirməsi fikri qeyri-adi görünməməlidir. XIII-XIV əsrlərlə müqayisədə XV-XVI əsrlərdə klassik poeziyanın dilində ərəb-fars mənşəli söz və ifadələr daha çoxdur. Əlbəttə, bu sözlərin içində oxucunun

baxmayaraq onların dilindən o qədər də təsirlənməmişdir. Onun şeirlərinin dilindəki bəzi cığatay elementləri Osmanlı və Azərbaycan ədəbiyyatında bir dəb əlaməti idi. Osmanlı dövlətində qalıb yaşamağa məcbur olduğu zamanda isə sənətkar bir sıra mühacir şairlərimizin üsulundan istifadə etdi, Azərbayacan və Osmanlı şeir həvəskarlarının eyni dərəcədə anlaığı dildə yazdı. Sırf Osmanlı elementləri onun şeirlərinin dilində o qədər də çox deyil, demək olar ki, həmin dövrdə Azərbaycanda yaşayan şairlərinki qədərdir (bəlkə bir az çox). Bəsiri şeirlərini əslində iki qardaş ölkənin şeir həvəskarları üçün yazırdı. Qeyd etdyimiz kimi, böyük Füzuli türk divanının dibaçəsində şeirlərinin dilində Osmanlı və cığatay elementlərinin kifayət qədər olmadığını göstərmişdir. Lakin o da Osmanlı oxucusunun onu asanlıqla başa düşməsinə çalışmışdır. Osmanlı dövlətinə mühacirət etmiş şairlərimizin, eləcə də bağdadlı şairlərimizin əsərlərində bu təmayülü müşahidə etmək mümkündür. Bəsiri (1466-1534) kimi Füzulinin (1494-1556) də doğum tarixi dəqiq deyil. Bəsirinin Füzulidən təxminən 20-25 il öncə dünyaya gəldiyi ehtimal olunur. Bu şairlərinin hər ikisinin ortaq yaşadıqları dövr də olmuşdur. Hər iki şair Sultan Süleyman Qanuniyə (1520-1566) qəsidə həsr edib. Sultan Süleyman 1534-cü ildə Bağdada daxil olarkən Füzuli ona qəsidə həsr etmiş, həmin il Bəsiri vəfat etmişdir. Müəyyən vaxt kəsiyində Bəsiri Füzulinin yaşlı müasiri olmuşdur. Lakin bununla bərabər, Füzuli istər poeziyamızın, istərsə də ədəbi dilimizin inkişafı baxımından yeni bir mərhələni təşkil edir. XV əsrin sonları-XVI əsrin əvvəlləri ədəbiyyatımızda qəzəl üslubunun geniş təsir dairəsinə sahib olması, qəzəl dilinin sadələşməsi ilə əlamətdardır. Professor Əzəl Dəmirçizadə "Azərbaycan ədəbi dilinin tarixi" adlı monoqrafiyasının birinci hissəsində yazır: "Bu dövrdə yetişmiş elə bir şair tapmaq olmaz ki, qəzəl

göstərən türkdilli şairlərin əksəriyyəti azərbaycanlı idi və onlar ədəbiyyatımızın Bağdad ədəbi məktəbi qolunun nümayəndəsi hesab olunurlar. Bəsirinin bağdadlı olması məsələsinə ən tutarlı cavabı bağdadlı olan Əhdi Bağdadi "Gülşəni-şüəra" təzkirəsində vermiş, şairin Ruma-Osmanlı dövlətinə köçmüş əcəm-azərbaycanlı olduğunu bildirmişdir. Ədalət xatirinə deməliyik ki, Nəsimi, Qazi Bürhanəddin, Füzuli və bir sıra digər şairlərin Azərbaycan türkü olduğunu göstərən Fuad Köprülü, İsmayıl Hikmət Ertaylan kimi böyük türk alimləri də vardır. Fuad Köprülü ilk dəfə 1926-cı ildə Bakıda çap edilmiş "Azəri ədəbiyyatına aid tədqiqlər" adlı əsərində XIII-XIV əsrlərdən osmanlı dilindən fərqlənməyə başlayan Azərbaycan türkcəsinin Şimali və Cənubi Azərbaycanda, İranın bir sıra bölgələrində, Şərqi Anadoluda geniş yayıldığını qeyd edir (21, s.12). Alim Nəsimi və Füzulidən danışarkən onların osmanlı ədəbiyyatına da güclü təsir etdiyini göstərir. Təbii ki, Nəsimi və Qazi Bürhanəddindən üzü bəri Osmanlı şairlərinin yaradıcılığına təsir etmiş görkəmli Azərbaycan sənətkarları, bu ölkəyə mühacirət edərək müəyyən mövqeyə sahib olmuş Arifi, Bəsiri, Bidari, Həbibi, Süruri,Xəzani, Xəlifə, Hamidi, Niyazi, Şahi və başqaları Osmanlı şeir dilinə də təsir etmişlər. Yəni, Osmanlı poeziyasının, şeirinin dilinə Azərbaycan ədəbi dilinin təsirini də nəzərə almaq lazımdır. Fikrimizcə, Osmanlı təzkirəçiləri Osmanlı ədəbi dilinə Azərbaycan türkcəsinin təsirini nəzərə almadıqlarına görə Bəsiri kimi şairlərimizin dilini sırf Osmanlı dili kimi təqdim etmişlər. Məsələn, bu faktı necə görməmək olar ki, Bəsirinin (eləcə də Nəsimi, Həbibi, Süruri, Füzuli və s.) dilində osmanlıcada olan felin indiki hal şəkilçisi –yor işlədilmir, hər yerdə -ır, -ir, -ur, ür şəkilçisi işlədilir. Bəsiri bir müddət Xorasanda yaşamasına, Nəvai və başqa özbək şairləri ilə ünsiyyətdə olmasına

"Həşt behişt"də yazır: "Burada şairlərlə eyni dildə danışdığı üçün onlarla arasında çoxlu münazirə və mühavirə olmuşdur. Türkcə şeirləri vardır. Bu səbəbdən şöhrətli Anadolu şairlərindən sayılıb" (19, s. 201). Ali "Künhül-əxbar" əsərinin təzkirə hissəsində yazır: "Türki ibaratı zəbanı-vüqu dedikləri istilahatı əcəmliginə görə eyü zəbt etmişdir" (20, s.152). Başqa sözlə, Osmanlı təzkirəçiləri iddia edirlər ki, Azərbaycan türkü olan Bəsiri İstanbula gəldikdən sonra əsərlərini gözəl mənimsədiyi osmanlıcada yazmışdır. Lakin bu fikirlə razılaşmaq mümkün deyil. Qeyd edək ki, bir sıra Osmanlı müəllifləri eyni fikirləri Nəsimi, Həbibi, Sürurі, Hamidi, Füzuli və başqa Azərbaycan şairlərinə də aid edirlər. Bəsiri öz şeirlərinin dili barədə bir fikir söyləməsə də, Füzuli söyləmişdir. Füzulinin dili ilə Bəsiri dili arasında yaxınlıq olduğuna görə Füzulinin divanının dibaçəsində dediklərini sitat gətiririk: "Təvəqqö budur ümumən əhaliyi-i`zzü etibardən,xüsusən büləğayi-Rum və füsəhayi-tatardən ki, əgər şahidi-hüsni-ibarətimdə ol diyarın əlfazü ibarətindən zivər olmasa və müxəddəreyi-nəzmim ol mülklərin lətaifü zərbül-məsəllərindən zinət bulmasa bu daini məzur buyuralar (17, s.32). Füzuli açıq-aydın bildirir ki, əsərləri dil, poetik ifadə tərzi baxımından Rum (Osmanlı) və tatar (özbək) sənətkarlarının dilindən müəyyən qədər fərqlənir. (Bu, dahi Azərbaycan şairinin əsərlərinin Türkiyə, Orta Asiya və digər türk məmləkətlərində bu günə qədər böyük məhəbbətlə oxunmasına maneə olmamışdır). Dolayısıyla şair özünün Azərbaycan türkü, dilinin də Azərbaycan türkcəsi olduğunu bildirməkdədir. Orasını da qeyd edək ki, Osmanlı təzkirəçisi Riyazi Bəsirinin bağdadlı olduğunu yazmışdır ki, bunun da əsas səbəbi, fikrimizcə, onun əsərlərinin dilinin Füzuli və başqa bağdadlı Azərbaycan şairlərinin dilinə yaxın olmasıdır. Məlum olduğu kimi,XV-XVI əsrlərdə Bağdadda fəaliyyət

məsələləri öyrənmişdir. Mir Cəlal haqlı olaraq yazır: "Füzulinin bədii surətlərini Nəsimidə, Həbibidə görürük. Bu, Füzulinin qətiyyən hazır bir mirasa yiyələndiyi demək deyildir. Bu, böyük şairin əvvəlki ədəbi irsə hörmət və məhəbbətlə yanaşdığını, ondan bir sənətkar kimi istifadə etdiyini, inkişaf etdiyini göstərir. Füzulinin böyüklüyü bir də orasındadır ki, o, öz şeirlərində XVI əsrə qədər ana dilimizdə yazan şairlərin yaxşı təcrübələrini hesaba almış, onu böyük cürət və məharətlə inkişaf etdirmişdi. (18, s.9).

Təzkirələrdə Bəsirinin alim, nüktədan şair adlandırılması məlumdur. Qeyd edək ki, Nəsimi, Kişvəri, Həbibi, Süruri, Hamidi və başqa şairlərimizin adına da bu epitetləri əlavə etmək olar. "Elmsiz şeir əsası yox divar kimi olur" deyən Füzuli isə XVI əsrin ən böyük alim şairi idi. O, bu məsələdə sələflərinin ənənələrini davam etdirərək onlardan daha irəli getmişdi. Yüksək hiss və duyğuların, dərin düşüncələrin ifadəçisi kimi qəzəl janrına, yaradıcılıqda orijinallığa, şeir mədəniyyətinin, şeir texnikasının inkişafına xüsusi fikir verən Füzuli həm sələflərinin yolunu davam etdirir, həm də özünün təkraredilməz sənət möcüzəsini yaradırdı. Bəsiri (eləcə də Nəsimi, Həbibi, Süruri, Hamidi və s.) kimi ömrünün mühüm hissəsini Osmanlı dövlətində yaşamış sənətkarlarla Füzuli arasında ana dilinə münasibətdə sələf-xələflik əlaqəsini görürük. Osmanlı təzkirəçiləri Azərbaycan türkcəsində yazan Bəsirinin sonradan İstanbulda yaşadığı zaman yerli ədəbi mühitə uyğunlaşaraq Osmanlı türkcəsində mükəmməl şeirlər yazdığını göstərirlər. Lətifi "Təzkirətüş-şüəra"da yazır: "Əksər ovqatın bu diyarda keçirməyin tərzi-şeirdə türki ibarət nəzmləri şivəsin və Rum şairləri işvəsin əda edər və tərzində təriqi-məxsusa gedər" (3, s.189). Lətifi burada şairin özünəməxsus yaradıcılıq üslubuna malik olduğunu da qeyd etmişdir ki, bu barədə daha ətraflı danışacağıq. Səhi bəy

ayə sirişkim nəzarəsi" misrasıyla başlanan qəzəli ilə eynidir. Bu cür nümunələrin sayını artırmaq olar. İki şair arasındakı yaxınlığı göstərmək üçün bəzi beytləri müqayisə edək:

**Bəsiri:**
Məcnun əgərçi padşəhi-mülki-eşq idi,
Şimdi mənəm yerində şəhənşahi-mülki-qəm.
**Füzuli:**
Sürdü Məcnun növbətin, indi mənəm rüsvayi-eşq,
Doğru derlər: hər zaman bir aşiqin dövranıdır
(17, s. 128)
**Bəsiri:**
Rüxlərində xalü zülfün pərişan olduğu,
Ey Bəsiri, surəti-hali-pərişanımdurur.
**Füzuli:**
Ey Füzuli, qəmi-hicr ilə pərişandır hal,
Kimsə agah degil hali-pərişanımdan (16 s.60)
**Bəsiri:**
Ey Bəsiri, olmadı ahın müəssir, gərçi kim,
Daşə təsir eylədi ah ilə əfğanın sənin.
**Füzuli:**
Daş dələr ahim oxu şəhdi-ləbin şövqindən,
Nola zənbur evinə bənzəsə beytül-həzənim
(17,s.216).

Bəsirinin mübaliğlərindən danışarkən gətirdiyimiz örnəklər iki sənətkarın yaxınlığını göstərən yeni dəlillər olacaqdır. Bu cür nümunələr gətirməkdə məqsədimiz Füzulinin sənət yolunda irəliləyərkən Bəsirini özünə ustad seçdiyini sübut etməkdən ibarət deyil. Dahi Azərbaycan şairi şeirə gələndə farsdilli, ərəbdilli sənətkarlardan da, Lütfi, Nəvai kimi özbək şairlərindən də, Nəsimi, Kişvəri, Həbibi, Süruri və.s kimi Azərbaycan şairlərindən də, Osmanlı şairlərindən də sənətin sirlərini, şeir texnikasını və başqa

yaşamış bir sıra sənətkarlarımızın Füzuli yaradıcılığına təsir etdiyini, Füzulinin şeir sənətinin sirlərini, şeir texnikasını öyrənməyə başladığı zaman bu şairlərdən öyrəndiyini, Nəsimi irsindən bəhrələnərkən onlardan örnək götürdüyünü deyə bilərik. Füzulinin birbaşa Nəsimi əsərlərini oxuyub bəhrələndiyi də şübhə doğurmur. Tədqiqatçılar böyük şairimizin Kişvəri, Həbibi, Süruri kimi şairlərin əsərlərindən bəhrələndiyini, onların şeirlərinə nəzirələr yazdığını göstərmişlər. Füzulinin təsirləndiyi sənətkarlardan birinin də Bəsiri olduğunu bildirmək istərdik. Əlbəttə, belə iddianı irəli sürərkən ehtiyatlı olmaq gərəkdir, vəzn, qafiyə, rədif eyniliyinin yüz faiz bir şairin digərinə nəzirə yazdığını demək üçün kifayət etmədiyini də nəzərə almaq lazımdır. Bəsirinin şeirlərində elə məqamlara rast gəlirik ki, onun Füzuli yaradıcılığına təsirindən danışmağa imkan verir. Məsələn, Bəsirinin "Çərxdir çeşmimi qılan pürab" misrasıyla başlanan qəzəlində belə bir beyt vardır:

Səni görmək duşumda mümkün idi,  
Neyləyim kim, gözümə gəlməz xab.

Bu beyt Füzulinin "Leyli və Məcnun" məsnəvisinə daxil edilmiş bir qəzəldəki

Bu vüsalə yuxu əhvalı demək mümkün idi,  
Əgər olsaydı yuxu dideyi-giryanimizə (16, 128).

-beytini xatırladır. Vəzn, qafiyə fərqi olsa da Füzulinin Bəsirinin bədii kəşfini qəzəlində daha da cilalayaraq, zinətləndirərək yeni biçimdə təqdim etdiyi görünür. Hər iki beytdəki "mümkün idi" ifadəsinin eyniliyi də diqqəti cəlb edir. Bəsirinin "Ağarsa gögə şöleyi-ahim şərarəsi" misrasıyla başlanan qəzəlinin vəzni və qafiyə sözləri (şərarəsi, sitarəsi, kənarəsi, parəsi, nəzarəsi, yarəsi) Füzulinin "Xoş gəldi dün ol

yazılmışdır. Lakin burada təsəvvüf, hürufilik ideyaları Nəsimi şeirində olduğu kimi əvvəldən axıra qədər səsləndirilməmişdir. Dördüncü beytdə hürufilik ideyası aydın surətdə ifadəsini tapmışdır. Həqqin nuru insanın üzündə təcəlli edib, aya bənzətmək belə bu uca varlığı alçaltmaq deməkdir:

Çərx qərbal eylər isə zərrə-zərrə xakimiz,
Nuri-Həqdir arizin, biz ana məhdir deməziz.

Bu şeirdəki "Başımızdan getmədi eşqin həvəsi, dostum" misrasıyla, ehtimal ki, Həsənoğlunun məşhur qəzəlindəki "Başımdan getmədi hərgiz sənünlən içdügüm badə" misrası arasında səsləşmə var. Ömər ibn Məzidin "Məcmuətün-nəzair" toplusundan görmək çətin deyil ki, Osmanlı ədəbi mühitində Həsənoğlu tanınırdı.

Bəsiri də Nəsimi kimi "Əfəndi" rədifli qəzəl yazmışdır. Nəsimi şeirini böyük ehtimalla mürşidi Fəzlullaha həsr etdiyi halda, Bəsirinin şeiri lirik-aşiqanə mövzudadır.

Bəsiridən başqa XV-XVI əsrlərdə yaşamış bir sıra Azərbaycan, Osmanlı, eləcə də özbək şairlərinin əsərlərində Nəsimi təsirini görmək mümkündür. Tədqiqatçılar Nəsiminin dahi Azərbaycan şairi Füzuli yaradıcılığına təsiri barədə fikir söyləmişlər. Mirzağa Quluzadə "Füzulinin lirikası" adlı monoqrafiyasında yazır: "Nəsimi lirikası Füzuli ədəbi istedadının yetişməsi üçün zəruri bir tarixi mərhələ təşkil edir. Bu iki sənətkar arasında bədii fikrin inkişafı nöqteyi-nəzərindən qanunauyğun bir əlaqə mövcuddur. Nəsimi və Füzuli Azərbaycan ədəbi-tarixi prosesinin bir-birini tamamlayan iki müxtəlif mərhələləridir. Nəsimi Azərbaycan dilində yaradılmış şeirin bünövrəsini işləyib divarlarını xeyli qaldırmışsa, Füzuli bu imarəti tamamlamaqla bərabər onun bütün zinətlərini vermişdir" (15, s.28). Nəsimidən sonra

ki,Tanrı həyatın hər bir sahəsində, təbiətdə, bütün kainatda təcəlli edir. Bəsirinin bu şeirə yazdığı, “Ey könül, gər Leyliyi görmək dilərsən, yarı gör” misrasıyla başlanan 7 beytlik cavab qəzəli əsasən lirik-aşiqanə mövzuya həsr edilib. Qəzəlin sonundan görürük ki, Bəsiri Nəsiminin təkcə bu örnək şeirindən deyil, bütün poetik yaradıcılığından xəbərdar olubdur. Son beytlərdə şair Nəsiminin şeirlərində tez-tez işlətdiyi “eynül-yəqin” (hərfi mənası: gözlə görüb yəqin etmə, ciddi surətdə inanma, şübhəsiz, şəksiz) ifadəsini işlədir, hürufi ideyanı səsləndirir: Tanrının nuru insanın üzündə əks olunmuşdur. Müəllif xüsusi olaraq vurğulayır ki, Tanrının insanda təcəllisini hər adam görə bilməz. Burada şair təxəllüsünə əsaslanaraq özünü hikmətləri görə bilən bəsirət əhli ilə birləşdirir. “Bəsiri” bəsirətli, Tanrının təbiətdə, kainatda, insanda təcəllisini görə bilən deməkdir:

Sürmeyi-eynül-yəqindən, zahida, çək gözünə,
Nuri-Həqqi görmək istərsən, gəl ol didarı gör.
Dost didarın, Bəsiri, görmək istərsən əgər,
Xabi-qəflətdən bəsirət çeşmini uyarı gör.

Maraqlıdır ki, şair öz təxəllüsünü bəsirət əhli olması ilə bağladığı  başqa bir qəzəlində də hər tərəfi, məscid və meyxanəni dolduran Həqqin nurundan danışır:

Ey Bəsiri, gər Bəsirət əhlisən, gözünü aç
Ki, doludur nuri-Həqdən məscidü meyxanə həm.

Bəsirinin yalnız Pərvanə nüsxəsində rast gəlinən, “Xəncərinə qarşu vardır bu dili-bibakimiz” misrasıyla başlanan qəzəli qafiyəsi, vəzni, ritmi, bəzi beytlərinə görə Nəsiminin “Dilbəra, şəmsüzzühadır ayəti-rüxsarınız”, “Ey cəmalın əksi-rəhman, qabi-qövseyn qaşınız” misraları ilə başlanan qəzəlləri ilə uyğun gəlir, bu şeirlərə cavab olaraq

misraslndakı “al” sözündən cinas kimi istifadənin başqa bir vriantını görürük. Bəsiri Nəsiminin

Gülşəni-firdövs edər can bağını vəsli-həbib,
Atəşi-duzəx qılır həm möhnəti-cövri-rəqib (14, s.27)

beyti ilə başlanan 7 beytlik qəzəlinə cavab olaraq iki qəzəl yazmışdır.Onlardan birincisi “Kirpigin ucunda, ey ziba həbib”, ikincisi isə “İki surət xubdur Həqdən mənə olsa nəsib” misrasıyla başlanır. Şeirinin ikinci beytində Nəsimi dərdinə ancaq yarının əlac edəcəyindən, təbiblərin ona heç bir faydası olmadığından danışır:

Dərdimin dərmaninə heç kimsə bilməz çün əlac,
Yardan özgə nə çarə, söyləgil sən, ey təbib (14,s.27).
Bəsirinin ikinci qəzəlin üçüncü misrası belədir:
Etmə zaye mənə sən yox yerə dərmanını,
Dərdməndi-eşqə dəramanmı bulunur, ey təbib.

Nəsimi bir beytində aşiqlərin gözəlin üzünə baxıb əndəlib-bülbül kimi xoş nəğmələr oxuduğundan bəhs edir:
Gül üzünə aşiq olub qanda bir üşşaq var
Xoş nəvayi saz edər daim nəvayi-əndəlib (14,s.27).

Bəsirinin cavab qəzəlində belə beyti vardır:

Pür dəgil bülbül tənində kim, güli vəsf etməgə,
Başdan-ayağa zəban olmuş çəməndə əndəlib.

Nəsiminin “Hər nəyə kim, baxır isən, anda sən Allahı gör” misrasıyla başlanan 9 beytlik qəzəli yüksək bədii formada təsəvvüf ideyalarının, vəhdəti-vücud təliminin təbliğinə həsr edilmişdir. Bəsirət gözü ilə baxmağı bacaranlar görə bilərlər

etdiyi “Məcmuətün-nəzair” toplusunda osmanlı şairlərinin Nəsimi qəzəllərinə yazdıqları nəzirələri nəzərdən keçirdikdə böyük Azərbaycan şairinin ədəbi irsinin sözün həqiqi mənasında osmanlı ədəbi prosesində iştirak etdiyinin şahidi oluruq. Bu əlbəttə ki, başa düşüləndir. Nəsimi ömrünün mühüm hissəsini vətənindən uzaqlarda, Anadoluda, Osmanlı imperatorluğunun ərazisində və yaxın yerlərdə yaşamışdır. Belə qüdrətli sənətkarın onu əhatə edən türkdilli şairlərin yaradıcılığına təsir etməməsi mümkün deyildi. Ağqoyunlu dövlətinin ərazisində olan Kərbəlada doğulmuş, gəncliyində Səfəvilər dövlətinin təbəəsi olmuş, həyatının yetkin çağlarında Qanuni Sultan Süleyman Bağdadı, İraqı tutduqdan sonra (şair Sultan Süleymanın 1534-cü ildə Bağdada daxil olmasına qəsidə həsr etmişdir) Osmanlı dövlətinin vətəndaşı olmuş Məhəmməd Füzuli də Osmanlı şairlərinin yaradıcılığına güclü təsir etmişdir. Osmanlı ədəbiyyatına Nəsimi və Füzulinin güclü təsiri tədqiqatçılar tərəfindən araşdırılmışdır (bu təsir o qədər güclü olmuşdur ki, sənətkarlarımızı osmanlı şairi kimi təqdim edənlər də az deyil).

XV-XVI əsrlərdə yaşamış Azərbaycan və Osmanlı şairləri Dədə Ömər Rövşəni, Gülşəni, Xəlili, Həqiqi, Kişvəri, Həbibi, Şah İsmayıl Xətai, Mühyiddin Abdal, Pir Sultan Abdal, Qoyunoğlu, Füzuli, Üsuli, Ruhi, Heyrəti, Yusifi-Sinəçak, Xəyali, Zati, Heydəri, Kəlami və başqalarının yaradıcılığında Nəsiminin ideyalarının, bədii kəşflərinin, şeir texnikasının təsiri özünü göstərməkdədir. Azərbaycanda doğulub ömrünün mühüm hissəsini – 1497-ci ildə vəfatına qədər İstanbulda yaşamış Bəsirinin şeirlərində də Nəsimidən bəhrələnmə özünü aydın şəkildə göstərməkdədir. Bəsirinin “Görmədin, ah, yüzi laləmizi” misrasıyla başlanan 5 beytlik qəzəlinin son beytində Nəsiminin “Al ilə alə gözlərin aldadı, aldı könlümü”

Üçüncü beytdə şair deyir ki, onun qəlbinin quşu sevgilisinin keçdiyi yerin kölgəsindəki ağacda özünə yer etmişdir. O, özünü məşuqəsinin bağına qonmuş aşiq bülbülə bənzədir və onu tutmağı xahiş edir:

Gülşəni-kuyin nihalın cay edərsə mürği-dil,
Bağına bir bülbüli-şuridə halət qondu, tut,

Dördüncü beytdə şair sevgilisinə müraciətən dünyanın qaraquşunun, qartalının onu ovladığını bildirir. Buna görə də onun başına hüdhüd quşu kimi qonmuş səadət quşunu vaxtında tutmaq, daha doğrusu, həyatın, ömrün gözəl çağlarının qədrini bilmək lazımdır-deyir. Bu beyt dünyanın vəfasının olmadığından danışan, bir günün qədrini bilməyi məsləhət görən Nəvai beytləri ilə səsləşir. Sonuncu beytdə Bəsiri qoynuna vəqfi-məhəbbətin, yəni məhəbbət mülkünün, məhəbbət sərvətinin qonduğunu və bunun qədrini bilməyin vacib olduğunu deyir:

Əksi-xətti-arizin vüslət şəbində dil gedər,
Ey Bəsiri, qoynuna vəqfi-məhəbbət qondı tut.

“Tut”, “Tutdum, tut” rədifli qəzəllərə Füzuli divanında da rast gəlirik. Məzmun və vəzndə fərq olduğuna görə bu şeirləri Nəvai qəzəlinə cavab hesab etmək olmaz. Hər halda, tamamilə mümkündür ki, Füzuli Nəvai sənətinə hörmət əlaməti olaraq  bu qəzəlləri yazmışdır.

Füzulidən öncəki Azərbaycan və Osmanlı ədəbiyyatında iki dahi türkdilli sənətkarın-Nəsimi və Nəvainin böyük nüfuz sahibi olması şübhə doğurmur (Xoca Əhməd Yəsəvi, Yunis İmrə, Şah İsmayıl Xətainin də nüfuz və təsirindən danışmaq olar. Lakin Nəsimi və Nəvai təsiri daha güclü olmuşdur). Ömər ibn Məzidin Nəsiminin ölümündən 20 il sonra tərtib

Şairin "Görgəc", "Qondı, tut" rədifli qəzəlləri onun cığatay ədəbiyyatına, Nəvai irsinə hörmətlə yanaşdığını göstərir. Nəvainin türkcə divanlarında "Görgəc" rədifli qəzəl olmasa da, sözün "görcək" deyil, "görgəc" kimi yazılması orta əsrlər özbək ədəbi dilinin təsiridir.

Bəsirinin "Qondı, tut" rədifli beş beytlik şeiri Nəvai qəzəlinə nəzirə olaraq yazılmışdır. Qeyd edək ki, "Qəraibüs-siğar", "Bədayiül –vəsət" adlı divanlarında Nəvainin "Boldı, tut" rədifli üç qəzəli vardır. Rədif sözləri tam üst-üstə düşməsə də Azərbaycan şairinin dahi özbək şairinin əsərinə cavab yazdığı şübhəsizdir. Bəsiri şeirinin Nəvainin əsasən "Bədayiül-vəsət" divanındakı "Boldı, tut" rədifi qəzəli ilə, daha çox bu qəzəlin əvvəli ilə səsləşdiyini görürük. "Bədayiül-vəsət" adlı divanına daxil olan 12 beytlik qəzəlinin əvvəlində Nəvai pərəstiş obyektinin yüksək mənsəbə ucaldığına görə sevinc hisslərini ifadə edir:

Taxtu tocinq kişvəri mülki-Skəndər boldı, tut,
Xızır ömri həm bu mülk üzrə müyəssər boldı, tut.
Böylə mülkü ömrdin sonq cinnü insü vəhşü teyr,
Hökmi-əmrinğə Süleymandek müsəxxər boldı, tut.

(13, s.25)

Şeirin sonrakı hissələrində həyatın vəfasızlığı, fürsət var ikən dünya nemətlərindən bəhrələnməyi bacarmağın lazımlığı, bu dünya-axirət barədə fəlsəfi fikirlər əksini tapmışdır.

Bəsirinin qəzəli də aşiqin pərəstiş obyektinin hökmdar kimi öyülməsi, onun başına şahlıq quşunun qonmasından bəhs edilməsi ilə başlanır:

Sərvəra, sərpənceyi-şahini-dövlət qondı, tut,
Fərqinə mürği-hümayü övci-izzət qondı, tut.
Saidündə sayeyi-zülfin, pəri-Cibril san,
Ya nihali-sidrə, ya tavusi-cənnət qondı, tut.

“əcəmanə”, yəni öz dili olan Azəri şivəsiylə şeirlər yazan Bəsiri daha sonra İstanbul türkcəsini kullanmağa başlamışdır. Bununla bərabər öz əl yazısı ilə qeyd etdiyi şeirlərində yer-yer Azəri şivəsinin izləri görülür” (11, s.105). Bu fikir barədə mülahizəmizi bildirmək istərdik. Əgər professor Mehmet Çavuşoğlunun dediyi kimi, Bəsirinin öz əli ilə yazdığı şeirlərdə Azərbaycan türkcəsi hiss olunursa, deməli, onun şeirləri yerli təzkirəçi və katiblərin təqdimində sırf osmanlıca səsləndirilmişdir. Bu qənaətdəyik ki, ömrünün əsas hissəsini Osmanlı dövlətinin vətəndaşı olmuş Füzulinin şeirləri necə Azərbaycan türkcəsindədirsə, Bəsirinin şeirləri də yerli şivə elementləri əlavə olunsa da Azərbaycan türkcəsindədir. Buna baxmayaraq, osmanlı müəllifləri Füzulini də, Bəsirini və başqa azərbaycanlı şairləri də osmanlı şairi hesab etmişlər.

Bəsiri əsərlərində az da olsa cığatay (orta əsrlər özbək ədəbi dili) elementləri vardır. Qeyd etdiyimiz kimi, Bəsiri bir müddət Xorasanın paytaxtı Heratda olmuş, bu dövlətin hökmdarı, həm də şair olan Hüseyn Bayqaranın, Əlişir Nəvainin, Əbdürrəhman Cami və Binainin rəğbətini qazanmışdır. Nəvai divanını ilk dəfə Osmanlı dövlətinə gətirən də o olmuşdur. Həmin dövrdə yaşamış digər bir Azərbaycan şairi Kişvəri (bu şairimizin Herata getməsi təsdiq olunmamışdır, ehtimal edilir) ilə müqayisədə Bəsiri şeirlərində Nəvai təsiri, əsərlərinin dilində cığatay elementləri o qədər də çox deyil. Şairin “Hər səhər gül yüzünə düşgün degildir jalələr” misrasıyla başlanan qəzəlində belə bir misra vardır: “Kuhkən tufrağidin hər yaz bitkən lalələr”. Buradakı “Kuhkən tufrağidin” (“Kuhkən, Fərhad torpağından”) ifadəsindəki ikinci sözdə “p” əvəzinə “f” səsinin işlədilməsi, çıxışlıq hal şəkilçisinin-dan,-dən deyil, -din olması cığatay dilinin əlamətidir (12, s.107). “Bitən” əvəzinə “bitkən”sözünün işlədilməsi cığatay dili təsiri ilə bağlıdır.

etdirmişdir (9). Əlyazması Paris Milli Kitabxanasında saxlanan "Məcmeyi-gül" də şairin 5 qəzəlinin mətlə beyti verilib. Bundan başqa, bəzi cünglərdə də onun şeirləri köçürülmüşdür.

Sağlığında lətifələri ilə tanınan Bəsirinin "Lətaif" ("Lətifələr") əsəri geniş yayılsa da hazırda bu əsər tam halda əldə yoxdur. Şairin seçmə lətifələrinin toplandığı natamam bir əlyazma nüsxəsi Konya Qoyunoğlu Muzeyi Kitabxanasında saxlanır. İkinci ağızdan nəql edilən bu lətifələrin bəziləri Lamiizadə Ləm`i Çələbinin topladığı atasına aid lətifələrin içindədir.

Bəsirin nəsrlə yazdığı kiçik həcmli "Bənginamə" əsərinin əlyazması Milli Kitabxana əlyazmaları Ankara Adnan Ötüken İl Xalq Kitabxanası Kolleksiyasında 06 HK 436-cı nömrə altında saxlanan "Məcmeyi-əşar və fəvaid" adlı əsərin 6a-7b vərəqlərində yazılmışdır. "Qoft mənla Bəsiri" başlığı ilə başlanan həmin hissə aydın hərəkəli nəsx xətti ilə köçürülüb. Əsərin əvvəlində müəllif ətrafdakıların ondan iştah artıran bir əhvalat danışmasını xahiş etdiklərini bildirir. Buna cavab olaraq Bəsiri yumorlu bir əhvalatı qələmə almışdır. Gülüş doğuran odur ki, dərdli və kabab həsrəti ilə acından ölmüş Bənginin (hərfi mənası:narkoman) məzarını müxtəlif meyvə və xörəklərlə bəzəyirlər. Əsərdəki xörəklərə həsr edilmiş iki şeir Bəsirinin türkcə şeirlər toplusuna da daxil edilib. Türk alimi Fatih Başpınar "Bənginamə"nin mətnini ilk dəfə olaraq latın qrafikası ilə nəşr etdirmişdir (10).

Bundan başqa, Bəsirinin divanına və təzkirələrə daxil edilmiş, qitə və beyt şəklində yazılmış, müxtəlif tarixi hadisələrə aid maddeyi-tarixləri də vardır.

Professor Mehmet Çavuşoğlu Bəsirinin türkcə şeirlərinin dili barədə yazır: "Osmanlı şüəra təzkirəçilərinin deyimilə

edilmiş türkcə şeirləri İstanbulun Süleymaniyyə Kitabxanasında 292-ci nömrə altında saxlanmaqdadır. Əlyazmanın əvvəlində Xacə Cahan Mahmud bin Məhəmməd əl-Gilaninin "Riyazətül-inşa" adlı əsəri köçürülüb (1a-292a). 229b-281b vərəqlərindəki farsca divanda şairin 23 qəsidə, 121 qəzəli vardır. Sonrakı hissədə şairin türkcə 1 qəsidə, 46 qəzəl, bəzi qitə və beytləri köçürülmüşdür.

Bəsirinin farsca divanının türk tədqiqatçıları Kutluxan Ərən və Fikrət Sarısoy araşdırmış, Əhməd Kartal onun Süleymaniyyə nüsxəsindəki türkcə şeirlərini latın qrafikası ilə çap etdirmişdi (5).

Bəsirinin şeirlər toplusunun Tehranın Milli Kitabxanasından əldə edilmiş, nəstəliq xətti ilə köçürülmüş avtoqraf nüsxəsi böyük maraq doğurur. Divanın əvvəlində (v.1a-156a) farsca divan, sonra isə (v.157a-194a) türkcə şeirlər yazılıb. Farsca şeirlər Peyğəmbərə həsr edilmiş nət qəsidəsi ilə başlanır. Bundan sonra 23 qəsidə gəlir. Ağqoyunlu Gödə Əhmədə 4, Ağqoyunlu Uğurlu Məhəmmədə 1, Sultan Hüseyn Bayqaraya 1, vəzir İbrahim Paşanın qəsrinə 1, Nişançı Cəfər Çələbiyə 1, Sultan II Bayəzidə 11, Sultan Səlimə 2, Sultan Süleymana 1 qəsidə həsr edilib. Bunlardan sonra farsca 154 qəzəl, rübai və fərdlər gəlir. Daha sonra türkcə 74 qəzəl və 4 qəsidə köçürülmüşdür.

İstanbulun Süleymaniyyə və Tehranın Milli Kitabxanasında saxlanan bu iki əlyazma divandan başqa bir sıra məcmuələrdə Bəsirinin ayrı-ayrı şeirlərinə rast gəlirik. Ədirnəli Nəzminin "Məcmueyi-nəzair"ində şairin 20 qəzəli, Pərvanə ibn Abdullahın "Pərvanə məcmuəsi"ndə 22 qəzəli, Sultan Xuban məcmuəsində 11 qəzəlinin mətləsi vardır. XVII əsrdə Qasımi tərəfindən yazılmış "Bəhrül-maarif" və ya "Sənduqətül-maarif" adlı məcmuədə Bəsirinin 13 qəzəli vardır. Türk alimi Ahmet İçli bu şeirləri ön sözlə nəşr

şairin və gərək məşhur Hüseyn Bayqaranın mənzumələrini bərabərində gətirmişdi” (Bax: 7,s. 269).

Lakin Bəsirinin maddi vəziyyəti heç də həmişə qənaətbəxş olmamışdır. Osmanlı sənədlərini araşdıran tədqiqatçılar göstərirlər ki,  II Sultan Bayəzidin zamanında padşahdan kifayət qədər yardım görən şairə sonrakı dövrlərdə  o qədər də yardım etməmişlər. Görünür “Gədayi-möhnətamuzəm, məni ac eyləmə, Ya Rəbb” misrasıyla başlanan qəzəlini şair həmin vaxtlarda yazmışdır.

Bəsirinin aşağıdakı əsərləri əlimizə çatmışdır: Farsca divan və türkcə şeirlər toplusu, “Lətaifnamə”, “Bənginamə” və maddeyi-tarixlər.

İsmayıl Hikmət şairin farsca divanı ilə türkcə şeirlərinin bir yerdə köçürüldüyü avtoqraf əlyazma nüsxəsinin İstanbulun Ali Emiri Kitabxanasında saxlandığını məlumat verir. Bundan başqa o, bildirir ki, Bəsirinin şeirlərindən nümunələr Ədirnəli Məhəmməd Nəzminin İstanbul Nuri-Osmaniyyə Kitabxanasındakı “Məcmə ən-nəzair”, İqdirli Hacı Kamalın İstanbul Ümumi Kitabxanasında saxlanan “Came ən-nəzair”, Sankt-Peterburq Dövlət Universiteti Şərq fakültəsindəki 452 nömrəli “Məcmuət ən-nəzair” və Rusiya Federasiyası Şərqşünaslıq İnstitutunun Əlyazmalar bölməsindəki B-307 şifrli müxtəsər “Məcmuətün-nəzair” toplusunda vardır (7, s.272). Professor Azadə Musabəyli şairin AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutundakı məcmuələrdə, Salman Mümtazın şəxsi arxivində saxlanan şeirlərini araşdırmış, onları Rusiya Federasiyası Şərqşünaslıq İnstitutunun Əlyazmalar Bölməsindəki, İ.Hikmətin “Azərbaycan ədəbiyyatı tarixi” kitabındakı şeirlərlə müqayisə etmişdir (8, s.10-11).

Çağdaş Türkiyə tədqiqatçılarının verdiyi məlumata görə, Bəsirinin öz əli ilə köçürdüyü farsca divanı və ona əlavə

vəfat etdiyinə əsaslanaraq şairin 1466-cı ildə doğulduğu fikrini irəli sürürlər. Bəsirin oğlu Cəlili də şair olmuşdur.

Osmanlı təzkirələri və özünün əsərləri Məhəmməd Bəsirinin xasiyyəti, həyat tərzi, insanlarla münasibəti barədə müəyyən fikir söyləməyə imkan verir. Onun gülərüz, zarafatcıl, elmli bir adam olduğunu, buna görə də yüksək vəzifəli şəxslərlə yaxınlıq etdiyini söyləyirlər. Qınalızadə Həsən Çələbi (1546-1604) 1586-cı ildə tamamladığı "Təzkirətüş-şüəra" əsərində Bəsirinin geniş bilikli, lətifələri ilə məşhur olduğunu, Ayasofya vəqfindən ülufə (üç aydan bir alınan maaş) və padşahdan salyanə (ildə bir dəfə verilən pul vəsaiti) aldığını bildirir. Həsən Çələbi yazır: "Mətai-məarifün mərdi-xəbiri və fününi-lətaifün naqidü bəsiridür.Əksər əşarü göftarı həzlə mail olmağın əshabi-dövlət və ərbabi-izzətün söhbətinə daxil olurdu. Həcviyyatü həzliyyatı vafir və lətaifü qəraibi mütəkasirdür (6, s.214).

Bəsiri haqqında Səhi bəy "Ziyadə maarifə və neçə lətaifə qadir kimsədir" demişdir. Lətifi onun barəsində yazır: "Əcəb lətifəquy, cərbzəban və şuxməcaz və əzblisandur. Hini-mühavirədə xandəruy, nədimşivə və bəzləquy, hərifi-zərif idi. Cəridələrə və cünglərə səbt olacaq rəngin lətaifi və lətaifə mütəəlliq məairi çok idi və xuyü xislətdə alacalığından qeyri eybi yok idi" (3, s.128). Digər təzkirəçilər də şairin üzündə dəri xəstəliyinin (dəmrov) əlamətləri olduğunu, buna görə "Alaca Bəsiri" kimi xatırlandığını bildirirlər.

Osmanlı müəllifi Cənab Şihabəddin Bəsirinin osmanlı ədəbiyyatına təsiri barədə yazır: "Ədəbiyyatımızın bu əsrdə iqbalı doğmaq üzrə ikən İrandan gələn şüəra arasında bir Bəsiri vardı ki, əgərçi böyük şair degilsə də, o dövrün cərəyani-ədəbisi üzərində dolayısıyla pək şayani-diqqət bir təsiri oldu. Şeyx Caminin və Əlişir Nəvainin tövsiyənamələri ilə Heratdan məmləkətimizə gəlirkən Bəsiri gərək o iki böyük

dövrlərdə qeyri-ərəb, sonralar isə İran və Azərbaycandan olan mənasında işlədilmişdir. Bəsiriyə aid edildikdə Azərbaycan türkü deməkdir. Ən vacibi isə odur ki, bütün mənbələr onun İstanbula Ağqoyunlu dövlətindən gəldiyini təsdiqləyir. Mənbələr göstərir ki, Bəsiri gəncliyində Ağqoyunlu hökmdarı Uzun Həsənin (1453-1478) oğulları - Uğurlu Məhəmməd (?-1477) və Yəqubun (1478-1490) yanında olmuş, onlara qəsidələr həsr etmişdir. Səyahətlər etmiş, təxminən 1487-ci ildə Xorasanın paytaxtı Heratda olmuşdur. Aşiq Çələbi onun Hüseyn Bayqara, Ə.Nəvai, Ə.Cami və Binainin xidmətində olduğunu qeyd etmişdir (4, s.195). Nəvai yerli mühitdə tanıtmaq üçün Bəsirinin adına müəmma yazmışdır. Bu müəmma müxtəlif mənbələrdə tövsiyənamə, sifarişnamə, namə də adlandırılır (5, s.79). Bəsiri təxminən 1491-ci ildə II Bayəzidin dövründə (1481-1512) İstanbula gəlmiş və özü ilə Nəvai, Ə.Cami və Binainin əsərlərini, adına Nəvai tərəfindən yazılmış müəmmanı gətirmişdir. Şair Uzun Həsənin Osmanlıya sığınmış oğlu Uğurlu Məhəmmədin II Mehmed Fatehin qızından doğulmuş oğlu Gödə Əhməd bəyin (iyul 1497-dekabr 1497) müsahibi olmuşdur. Gödə Əhməd 1497-ci ildə hakimiyyətə gəldikdən sonra Bəsirini elçi sifəti ilə İstanbula, II Bayəzidin yanına göndərir. Şair İstanbulda olarkən Gödə Əhmədin öldürüldüyünü öyrənir, bundan sonra geri qayıtmır, evlənərək ömrünün sonunadək burada yaşayır. İstanbulda yaşadığı zaman o, Tacizadə Cəfər Çələbi, Müəyyədzadə Əbdürrəhman Çələbi, dəftərdar İskəndər Çələbi kimi şəxslərdən dəstək görmüşdür. Bəsirinin Zati, Qəndi, Kəşfi kimi osmanlı şairləri ilə dostluq etdiyi barədə məlumat vardır. Şair h.941-ci ildə (m.1534-1535) təxminən yetmiş yaşlarında vəfat etmiş, İstanbulun Ədirnəqapısı kənarındakı məzarlıqda, deyilənə görə, Zatinin qəbrinin yanında dəfn edilmişdir. Tədqiqatçılar yetmiş yaşlarında

ədəbi-mədəni həyat xüsusilə Hüseyn Bayqaranın hakimiyyəti illərində çiçəklənmişdir. Osmanlı imperatorluğunda Herat ədəbi mühitinə böyük maraq olmuş, Sultan Mehmed Fateh (1451-1481) bəzi əsərləri ölkəsinin mədrəsələrində dərslik kimi istifadə olunan Əbdürrəhman Camiyə (1414-1492) maaş təyin etmişdir (2, s.8). Bir sıra osmanlı təzkirəçiləri, o cümlədən, müasiri Qəstimonulu Lətifi (1491-1582) "Təzkirətüş-şüəra və həbsirətün-nüzəra" adlı əsərində göstərir ki, Əlişir Nəvai divanını Anadoluya ilk öncə Bəsiri gətirmişdir (3, s.128). Təkcə bu fakt Azərbaycan şairinin Osmanlı ədəbi mühitində oynadığı rol, türk xalqları arasındakı ədəbi əlaqələrin inkişafı sahəsindəki xidmətləri barədə danışmağa imkan verir. İstanbulun Süleymaniyyə kitabxanasında saxlanan farsca divanında (buraya onun türkcə şeirləri də əlavə edilmişdir) adı Məhəmməd bin Əhməd bin Əbül-Məali əl-Mürtəza kimi gedən Bəsirinin İstanbula haradan gəlməsi barədə müəlliflər müxtəlif fikirlər söyləmişlər. Məhəmməd Qəzvini, Səhi bəy, Gelibolulu Ali onun Əcəm, Lətifi Əcəm sərhəddinə yaxın bir yerdən olduğunu söyləyirlər. Aşiq Çələbi və ondan istifadə edən Həsən Çələbi, Bəyani, Mehmed Sürəyya və Şəmsəddin Sami şairin xorasanlı, Riyazi və Katib Çələbi isə bağdadlı olduğunu göstərirlər. Fikrimizcə, Bəsirinin xorasanlı olduğunu söyləyənlərin səhvi onun bu diyara gedib Herat ədəbi məktəbinin nümayəndələrinin əsərlərini İstanbula gətirməsi faktından qaynaqlanır. Bağdadlı olduğunu deyənlər isə, yəqin ki, dilinə əsasən bu fikri söyləmişlər. Məlumdur ki, bu dövrdə Bağdadda yaşayıb-yaradan sənətkarların çoxu əsərlərini Bəsiri kimi Azərbaycan türkcəsində yazırdı. Məsələ orasındadır ki, şairin həmyerlisi Məhəmməd Qəzvini onu Mövlana Bəsiriyi-Əcəm adlandırıb, Əhdi Bağdadi isə diyari-Ruma köçmüş əcəm olduğunu bildirmişdir. "Əcəm" sözü ilk

çalışmışlar. Böyük Azərbaycan şairi və yazıçısı, rəssam və alimi Sadiq bəy Əfşar (1533-1610) qardaş özbək ədəbiyyatına, Əlişir Nəvaiyə hörmət əlaməti olaraq əsərlərinin mühüm hissəsini cığatay türkcəsində-orta əsrlər özbək ədəbi dilində yazmışdır. Məktublarından birində, o, Azərbaycan türkcəsində, osmanlıcada, cığatayda sərbəst yazdığını məlumat verir. Görkəmli ədib Ə.Nəvainin "Məcalisün-nəfais" təzkirəsinin təsiri ilə cığatayca yazdığı səkkiz fəsildən ibarət olan "Məcməül-xəvas" təzkirəsinin "Müasir padşahlar haqqında" adlı birinci fəslində şeir yazan hökmdarlardan biri - dəfələrlə Səfəvilər dövlətinə hücumlar etmiş Osmanlı hökmdarı Sultan Süleyman (1520-1566) barədə belə yazır: "Özü də çox mülayim şeir təbinə malik idi və "Mühibbi" təxəllüsü ilə yazırdı. Deyilənə görə, bu təxəllüsü onunla mərhum padşah (I Şah Təhmasib Səfəvi) arasında olan düşmənçilik dostluğa və ədavət məhəbbətə çevrilən vaxt qəbul edib. Hər halda, bu təxəllüsdən məhəbbət zahir olur" (1, s.24). Əlbəttə ki, Sultan Süleyman şeirdə "Mühibbi" təxəllüsünü iki dövlət arasındakı münasibətlərin yaxşılaşması münasibəti ilə qəbul etməmişdir. Faktın bu cür şərh edilməsi ədiblərimizin ölkələri yaxınlaşdırmağa çalışdığını, onların arasındakı münasibətlərin yaxşılaşmasına sevindiyini bariz şəkildə göstərməkdədir.

Həyat və yaradıcılığı ilə türk xalqları ədəbiyyatlarını bir-birinə yaxınlaşdırmağa çalışmış, Azərbaycan-özbək-osmanlı ədəbi əlaqələrini daha da möhkəmləndirmiş sənətkarlardan biri də Bəsiridir. O, Azərbaycanda, Təbrizdə dünyaya gəlmiş, özbək ədəbiyyatının görkəmli nümayəndələri ilə tanış olmaq üçün Xorasana, Herata səfər etmiş, ömrünün ən mühüm hissəsini, Osmanlı dövlətində, İstanbulda yaşamışdır. Şairin həyatından danışdıqda Təbriz-Herat-İstanbul üçbucağı ilkin olaraq diqqəti cəlb edir. Tarixdən məlumdur ki, Xorasanda

**PAŞA KƏRİMOV,**
*AMEA Məhəmməd Füzul adınaƏlyazmalar İnstitutunun direktor müavini,filologiya elmləri doktoru*

# AZƏRBAYCAN ŞAİRİ BƏSİRİ VƏ ONUN ƏDƏBİ İRSİ

XV-XVI əsrlərdə Yaxın və Orta Şərqdə bir sıra qüdrətli türk dövlətlərinin mövcudluğu, bu dövlətlərin ərazisində qədim mədəniyyət mərkəzlərinin çiçəklənməsi diqqəti cəlb edir. Hindistanda Teymurun nəvəsi Babur şah (1483-1530) tərəfindən əsası qoyulan Böyük Moğol İmperatorluğu (1526-1857), Xorasanda Hüseyn Bayqaranın (1438-1506) hökmdarlıq etdiyi, Əlişir Nəvainin (1441-1501) vəziri olduğu dövlət (1470-1507), Orta Asiyada paytaxtı əvvəl Səmərqənd sonra Buxara olan Şeybanilər dövləti (1500-1598), özbək xanlıqları, Azərbaycanda və İranda Qaraqoyunlular (1406-1468), Ağqoyunlular (1467-1501), Səfəvilər (1501-1736) dövlətləri, Anadolu, Şərqi Avropa və Afrikanın bir hissəsində Osmanlı imperatorluğu (1299-1924), Misirdə və Suriyada Məmlüklər dövləti (1250-1517), Qara Dənizdən şimalda Krım xanlığı (1443-1783) var idi. Münasibətləri çox da sadə olmayan, bir sıra hallarda öz aralarında müharibələr aparan Osmanlı və Səfəvilər dövlətlərində mədəniyyətin, ədəbiyyatın, anadilli poeziyanın tərəqqisi əlimizə çatmış yazılı mənbələrdə özünü bariz şəkildə göstərməkdədir. Bu türk dövlətləri arasında sisyasi ziddiyyətlər nə qədər kəskinləşsə də ziyalılar, şair və yazıçılar həmişə qardaş ölkələrin ədəbiyyatlarını, mədəniyyətlərini yaxınlaşdırmağa

*Öldürürsə , bizə nə,  vaizi-şəmşiri-xətib,*
*Badə sunsunun, bizə tək yari əli-rəğ mi-rəqib,*
*Banə olursa ola,  neçiyədək böylə şəkib,*
*Məsti-layi-əql olalım, yaxələr çak idəlüm.*

*Nicə bir cövrilə bülbül kimi giryan olalım,*
*Dəm bu dəmdir, içəlim , gül kimi xəndan olalım,*
*Hatəmi-can ilə məclisdə Süleyman olalım,*
*Məsti-layi-əql olalım, yaxələr çak idəlüm.*

*Ey Bəsiri, dirübən, ədrinə nunın, xublərin,*
*Tazə sözlərlə axıdub kəndinə məhbublərin,*
*Göylərə  axduribən zövqü səfa tublarının,*
*Məsti-layi-əql olalım, yaxələr çak idəlüm.*

Bu kimi, elmi yeniliklər Firuz bəyin hazırladığı kitabda öz əksini tapmışdır. Biz Firuz müəllimə gələcək işlərində uğurlar diləyirik onun  fərdi söhbətlərindən də məlum olur ki, planları çox genişdir və klassik irsimizin tədqiqi və nəşrinə dair yeni işləri var. Bu müqəddəs işində Firuz Rifahiyə Azərbaycan elmi ictimaiyyəti adından dərin təşəkkür edirəm və ümid edirəm ki, peşəkar alimimiz bundan sonra da bizi yeni-yeni kitabları ilə sevindirəcəkdir.

**ədəbiyyat**


1. Azərbaycan ədəbiyyat tarixi. 3-cü cild. Bakı, Elm, 2009
2. Səfərli Ə. və Yusifov X. Azərbaycan ədəbiyyatı tarixi. Bakı, Ozan, 2008
3. Babayev Y. Azərbaycan ədəbiyyatı tarixi. Bakı, “Elm və təhsil”, 2014
4. Həbibbəyli İ. və İbrahimov S. Vahid Şərq ədəbi prosesi. Bakı, 2018


**Sənan İbrahimov**
**Bakı Dövlət Universitetinin professoru**

poeziyasındakı təcnislərin zövqünü alır, həm də divan şeirindən gəlmə yüksək poetikaya valeh olur. Bəndin birinci misrasında "*mey alə*" məkan mənasında işlənmiş, yəni, "*mey alınan yerə kimi",* ikinci misrada "*almaq*" və üçüncü misrada isə "*ala gözlər*" mənasında işlənmişdir. Bu kimi poetik ricətlər, həm də şairin şəxsiyyətini təyin etməyə imkan verir. Çünki aşıq şeirindən gəlmə poetik məziyyətlər, dilimizdə işlənən sözlərin mənasının dəqiq verilməsi göstərir ki, şair əsil azərbaycanlıdır. Beytdəki "*kimi*" sözünün birinci misrada "*qədər, -dək*" mənasında işlənməsi də göstərir ki, Bəsiri Azərbaycanın cənub bölgəsindəndir. Çünki bu bölgələrdə daha çox "*qədər*" yerinə "*kimi*" kəlməsi işlədilir: *evə kimi(qədər), məktəbə kimi(qədər), məkana kimi(qədər) və s.*

Biz mətnşünaslığımızda Firuz Rifahi metodunu qeyd etdik. Firuz bəyin nəşr metodu belədir ki, mətni həm əski əlifbada (orijinalda), həm də müasir əlifbada paralel verir. Bu metod elm üçün o qədər əhəmiyyətlidir ki, onu daha çox alimlər bilir. Əski əlifbada şeirlər əruzda yazılıbsa, onların bəhrini təyin etmək asan olur. Belə ki, əruz ərəb praktikasına əsaslandığına görə yazıda əksini tapan A, U, İ hərfləri samit hesab edilir və qapalı heca sayılır. Bununla da şeirin hansı bəhrdə yazıldığını asanlıqla təyin etmək mümkün olur:

| | | | |
|---|---|---|---|
| *fa"ilAtun* | *fa"ilAtun* | *fa"ilAtun* | *fa"ilun* |
| *Saqiya, yo* | *-luna can nəğ* | *-dini, gəl, hək -* | *idəlüm,* |
| *Məsti-layi* | *-"əql olalım,* | *-yaxələr çak -* | *idəlim* |

*Saqiya, yoluna can nəğdini, gəl, hək idəlüm,*
*Qilü qaşdan arıdıb, xatirimüz, pak idəlüm,*
*Əqlimiz cəm" idəlüm, kəndümiz idrak idəlüm,*
*Məsti-layi-"əql olalım, yaxələr çak idəlüm.*

*Oxuyub səfheyi-gülzaridə, işrət vərəqın,*
*Gəl, könül, tərki-güman ilə olub, əhli-yəqin,*
*Ki, çəməndir, dil alıb, fürsəti fövt etmə, saqın,*
*Məsti-layi-əql olalım, yaxələr çak idəlim.*

ilk dəfə Firuz Rifahi tərəfindən həyata keçirilmişdir. Bu praktika imkan verir ki, kitablar həm də tədqiqat üçün ilkin qaynaq olsun. Müəllif kitaba Bəsirinin bütün əlyazmalarını salmışdır. Ona görə də, kitabı akademik nəşr də hesab edə bilərik. Şeirlərin dəqiq transletrasiyası onun mənasının da asanlıqla anlaşılmasına xidmət edir:

*Xalqa cahan gülistan, gülzar mana zindan,*
*El ğönçə kimi xəndan, mən əbr kimi giryan.*

*Hər qətrə-qətrə qan kim, tögüldi çeşmi-tərdən,*
*Ərbabi-eşqə oldı təsbihi-ləlu mərcan.*

*Göclər kaman əbru, qaşında müjgan oxun mənimçün.*
*Kafər gözünə, ya rəb, mən netdim a müsəlman.*

*Geyib qəbayi-gülgun, ey sərv-qəd, salınsan,*
*Qılmazdı xalq içində, çak olmadan gəriban.*

*Bir busənə həbibim can etmiş almaq etmiş nirx.*
*Təəcil et Bəsiri kim, tez olar pəşiman.*

Bəsiri ədəbiyyat tariximizdə xalq şerindən gəlmə poetik fiqurları divan şeirində elə məharətlə istifadə etmişdir ki, sanki oxucu divan şerinin mürəbbesini deyil, xalq şerinin qoşmasını oxuyur. Qoşmada olan cinas sözlər elə məharətlə seçilib yerində işlənmişdir ki, şeirin bəlağət və fəsahəti qat-qat artmışdır:

*Kəlməmiz qızdı, varuraq bizə "mey alə" kimi,*
*Yaar dəxayi varuraq qəsd qıla alə kimi,*
*Sinədə güllər açub bizdə, o gözi alə kimi,*
*Məsti-layi-"əql olalım, yaxələr çak idəlüm*

Bu beytdə "*alə*" sözü cinas kimi şeirdə elə məharətlə istifadə olunmuşdur ki, oxucu şeiri oxuyarkən həm xalq

“çap olunmamışdır” boşluğunu Firuz bəy aradan qaldırmışdır.

Bəsiri haqqında “Azərbaycan ədəbiyyatı tarixi” kitabında Vəcihə xanım Feyzullayevanın da maraqlı fikirləri var: “Şair öz zəmanəsinin böyük lətifə ustadı kimi tanınmış, satirik şeirlər yazmışdır... Şair mədh xarakterli qəsidələr də qələmə almış, müasirləri ilə müsabiqə və müşairələrdə yaxından iştirak etmişdir”(1, 273-274). Bu kimi qeydlərdən sonra bir neçə şeir əsasında mühakimə yürüdən alimlərimiz Bəsirinin yüksək poetikasından ətraflı bəhs edə bilməmişlər. Adətən onların yazdıqları bir-iki səhifəni keçməmişdir. Artıq Firuz bəyin elmi nəşrindən sonra Bəsiri haqqında cild-cild elmi monoqrafiyalar yazmağa imkan yaranır.

Kitabın əvvəlində müəllif Bəsirinin fars dilində yazdığı lirik şeirləri vermişdir. Şairin fars dilində yazdığı şeirlər sənətkarlıq baxımından orta əsrlər divan şeirinin nadir nümunələridir. Təbii ki, sultanlara yazdığı mədhiyyələr də fars dilindədir və həmin şeirlər özünün poetikası ilə qəsidə janrının gözəl nümunələridir. Şairin fars dilində yazdığı şeirlər əsasında mühakimə yürüdən Firuz müəllim, Bəsirinin Orta Asiyaya səfər etməsindən, Herat şəhərində olmasından, Cami və Nəvai ilə şəxsən tanış olmasından danışır. Bu kimi elmi məlumatlar bizim üçün böyük əhəmiyyət kəsb edir. Çünki XVI əsrdə Səfəvilər dövlətinin yaranması ilə, Azərbaycanın nüfuzu artır və yaranmış Azərbaycan Səfəvi dövlətinin siyasi ideologiyasının lazımi səviyyədə bütün müsəlman dünyasında təbliğinə ehtiyac vardı. Şah Qasim Ənvar kimi, Bəsirinin də Orta Asiyaya gedib qabaqcıl alim və şairlərlə görüşməsi, onlarla ədəbi əlaqələr yaratması, həm də azərbaycançılığın siyasi nüfuzu demək idi. Bu mənada, Bəsirinin ədəbi irsi ilə yanaşı siyasi fəaliyyəti də tədqiqat obyektidir.

Kitabın ikinci hissəsində Bəsirinin türkcə divanı verilir və yazdığı qəzəllərin, mürəbbelərin, qitələrin, müfrədlərin latın qrafikası ilə transletrasiyası verilir. Onu da qeyd edək ki, əlyazmaların həm əski əlifbada, həm də müasir əlifbada nəşri

nəşriyyata təqdim etmişdir. Kitabı oxuyandan sonra xalqımızın zəngin ədəbi-mənəvi sərvətinin bir daha şahidi oluruq və Bəsiri kimi möhtəşəm şairlərimizin xidmətləri qarşısında baş əyirik. Doğrudan da, dünyanın ən sivil xalqlarından olan "Azərbaycan xalqının" necə də zəngin mədəniyyətə malik olduğunu Bəsiri kimi şairlər sübut edir. Onlar tarixdə boyunlarına düşən bütün məsuliyyətin öhdəsindən gəliblər: zəngin ədəbi irs yaradıblar. Bizim nəslin vəzifəsi də həmin zəngin irsdən çıxış edib qabaqcıl vətəndaşlar tərbiyə edib, möhtəşəm mədəniyyətimizi bütün dünyada təbliğ etməkdir. Bu müqəddəs missiyanı həyata keçirən azərbaycanlı zilalılardan biri də Firuz Rifahidir. Onun ağır zəhməti sayəsində görkəmli klassikimiz Bəsiri haqqında elmi üfüqləri daha da genişləndirmişdir. Bu mənada, Firuzun bu kitabınadək Bəsiri haqqında bildiklərimiz və bundan sonra biləcəklərimiz nədir?

Bəsiri haqqında Azərbaycan elmi ictimaiyyət yalnız Şəhi, Lətifi, Həsən Çələbi, Riyazi, Ali, Övliya Çələbi, Əhdi Bağdadi, Şəmsəddin Sami kimi orta əsr təzkirəçilərinin qeydlərindən bəzi məlumatlar əldə etmişdir. 1928-ci ildə İsmayıl Hikmət də ondan bəhs etmiş və həmin fikirlər sonra "Azərbaycan ədəbiyyatı tarixi" kitabına salınaraq təkrar edilmişdir. Bu bəsit elmi mülahizə indiyədək yazılan kitablarda təkrar edilir. Ə. Səfərli və X. Yusifov yazır: "Uzun müddət Türkiyədə yaşayan Bəsiri, türk şairlərinə güclü təsir göstərmiş, Nəvai və Cami irsini Türkiyəyə gətirib, orada yaymış, .. Sultan Məhəmməd xan fatehdən Sultan Bayəzidə qədər bir çox sultanların sarayına yaxın olmuş, sarayın zövqünü oxşayan şeirlər yazmışdır" (1,353). Professor Yaqub Babayev isə kitabında onun barəsində yazır: "Bəsiri Azərbaycanda doğulub, böyümüş, sonradan Osmanlı məmləkətinə gedərək ömrünün sonuna qədər orada qalmışdır...maraqlı lətifələr müəllifi kimi tanınmış... ərəb, fars və Azərbaycan dillərində şeirlər yazmışdır. Divanı gəlib günümüzə çatsa da, çap olunmamışdır" (3,315). Artıq bu

## Bəsiri haqda nə bilirdik, indi nə bildik?
(ön söz əvəzi)

Bakı Dövlət Universitetinin istedadlı məzunlarından biri olan Firuz Rifahinin tərtibatında XVI əsr şairimiz Məhəmməd Bəsirinin(...- 1535) fars və türkcə divanın nəşrə hazırlaması ədəbiyyatşünaslığımız üçün, sözün həqiqi mənasında, böyük nailiyyətdir. Onu da nəzərə alsaq ki, mətnşünaslıq sahəsində Azərbaycan elmi son vaxtlar son dərəcə zəiflədiyi halda İranda yaşayan alimlərimiz tərəfindən belə təşəbbüslərin edilməsi son dərəcə təqdirəlayiqdir. Çünki orta əsrlərdə yaşayan minlərlə şair və yazıçılarımızın əlyazmaları öz tədqiqatçılarını gözləyir. Bu tələbatı nəzərə alan Sovet elmi müvafiq elmi institutlar (Əlyazmalar İnstitutu), şöbələr açmış, müntəzəm olaraq "Mətnşünaslıq" adlı məcəllənin nəşrini həyata keçirmiş, ancaq müstəqillik dövründə bu imkanlar nəinki zəifləmiş, hətta ali məktəblərin filologiya fakültələrində tədris olunan "Mətnşünaslıq" fənni proqramdan çıxarılmışdır. Nəticədə, mətnşünaslıq sahəsində boşluq yaranmışdır. Son illər klassiklərimizin ədəbi irsi ilə əlaqədar həyata keçirilən mətnşünaslıq işlər yalnız Firuz Rifahi kimi qeyrətli, vətənpərvər ziyalılarımız şəxsi təşəbbüsü və şəxsi vəsaiti hesabına meydana gəlmişdir.

Firuz Rifahi bundan əvvəl bir neçə klassikimizin əlyazmalarının tənqidi mətnini hazırlayıb nəşr etdirmişdir. Halbuki, həmin klassiklərimizin ədəbi irsi haqqında ədəbiyyatşünaslığımızda bəsit məlumatlar var idi. Əhmədi Təbrizinin "Şeyx Əbdül-Rəzzaq" dastanı, Mövlana Şəmsin "Yusif və Züleyxa" poeması, Qul Əlinin "Qisseyi-Yusif", Rüstəm Dərvişin Azərbaycan dilinin qrammatikasına dair risaləsi və s. Firuz Rifahinin ağır zəhməti sayəsində həyata keçmişdir.

İndi isə Firuz müəllim Məhəmməd Bəsirinin fars və Azərbaycan dillərində divanını 299 səhifədə çapa hazırlayıb,

**Önsöz yazanlar:**

**Sənan İbrahimov, Bakı Dövlət Universitesinin professori.**

**Paşa Kərimov,Filologiya Elmləri Dotoru, AMEAnin Məhəmməd Fuzuli adında Əlyazmalar İnstitutun müavini**

**Kitab- Məhəmməd Bəirinin Farsca-Azərbaycan Türkcəsində olan şeirləri yeni aşkar ediyimiz iran Milli Kitabxanası Əlyazması əsasında hazırlanıbdır.**



**Divan Of Poems of Mohammad Basiri famous 15th century poet of Azerbaijan Iran , is compiled upon his newly introduced manuscript kept at Iran Nationa Library. Complete poems of the poet has been collrcted prepared by Firuz Refahi Alamdari.**

**Publisher: Savalan Igidleri**
**First Published at Tehran 2020**
**ISBN: 978-622-6739-90-0**
**Email: firuzrefahi@gmail.com**

# Məhəmməd Bəsiri

## Türkçə–Farsca

# DİVANI

**İran Milli Kitabxana Əlyazması Əsasında**
**No. 5-29044**

**Hazırıayan:**
**Firuz Refahi Ələmdari**

**Tehran**
**2020**

*Məhəmməd Bəsiri*

Türkçə-Farsca

# DİVANI



**HAZIRLAYAN:**
**FİRUZ REFAHİ ƏLƏMDARİ**